## Seyyid Sabiq

# FİQHU SÜNNƏ

(təharət fəsli)

Tərcümə edən:
Mübariz Qarayev

**Redaksiya heyəti**

M. N. Qarayev
Ə. Z. Musayev
S. Z. Səfərbəyov
A. X. Salehli
T. C. Abdullayev

**Kompüter tərtibatı**

M. N. Qarayev
E. Q. Rüstəmov

**Bu kitab Azərbaycan Respublikası Dini Qurumlarla İş üzrə Dövlət Komitəsinin razılığı ilə çap edilmişdir.**

**(DK-535/B 14.09.2010)**

# MÜQƏDDİMƏ

Həmd olsun aləmlərin Rəbbinə! Allahın salavatı və salamı olsun bəşəriyyətin ən hörmətlisi olan *peyğəmbərimiz* Muhəmmədə ﷺ, onun əhli-beytinə, onun əshabələrinə və Qiyamətədək onun yolunu tutub gedən möminlərə!

Bu kitab Quran ayələri, mötəbər hədislər və alimlərin yekdil fikirləri ilə əsaslandırılmış İslam fiqhinə dair məsələlərdən bəhs edir.

Mən müsəlmanları maraqlandıran *fiqhi məsələlərdən bəhs edən* bu risaləni sadə və başa düşülən dildə, ətraflı izah olunmuş formada və bəzi ixtilaflı məsələlər istisna olmaqla, alimlər arasında olan ixtilafları qeyd etmədən oxuculara təqdim edirəm.

Bir neçə cilddən ibarət olan bu kitab – Allahın Muhəmmədə ﷺ göndərdiyi şəriət qayda-qanunlarını düzgün şəkildə insanlara çatdıran, Allahın və Onun elçisinin kim olduğunu onlara başa salan, onları Kitab və Sünnə üzərində birləşdirən, ixtilaflara, bidətlərə və məzhəb təəssübkeşliyinə son qoyan, habelə ictihad qapılarının bağlanmış olduğunu iddia edən avamlara cavab verən bir kitabdır.

Belə bir kitabı yazıb ortaya çıxarmaqda məqsədimiz, dinimizə xidmət etmək və qardaşlarımıza fayda verməkdir.

Allahdan diləyimiz budur ki, bunun sayəsində *müsəlmanlara* fayda versin və bizim bu əməlimizi Onun xatirinə görülən işlərdən etsin! Allah bizə bəs edər. O nə gözəl vəkildir!

Hicri: 15 şaban 1365
Qahirə

# GİRİŞ

## *İslam risaləsi – onun hərtərəfli olması və qayəsi*

Uca Allah Muhəmmədi ﷺ insanlara gözəl həyatı zəmanət verən, onları ən kamil və ən uca mərtəbələrə yetişdirən xalis tövhid dini ilə və hər şeyi əhatə edən İslam qayda-qanunlarıyla göndərdi. Allahın peyğəmbəri ﷺ iyirmi üç il ərzində insanları Allahın dininə dəvət etmiş və dini təbliğ edib insanları bu din üzərində cəm etməyə nail olmuşdur.

İslam dini, öncəki dinlər kimi yalnız bir nəsilə yaxud bir qəbiləyə məxsus olub başqalarını faydalandırmayan, müəyyən çərçivədə təbliğ olunan bir din deyildir. Əksinə, bu, yer üzündə olanların hamısına buyurulan, hər məmləkətə və hər zamana aid olan bir dindir. Uca Allah buyurur: **“Aləmləri xəbərdar etməsindən ötrü Öz quluna Furqanı *(Quranı)* nazil edən *Allah* necə də xeyirxahdır!”** (əl-Furqan, 1). **“Biz səni bütün insanlara müjdə verən və xəbərdarlıq edən *bir peyğəmbər* kimi göndərdik. Lakin insanların çoxu *bunu* bilmir”** (Səba, 28). “De: **“Ey insanlar! Şübhəsiz ki, mən sizin hamınız üçün Allahın elçisiyəm. Göylərin və yerin hökmranlığı Ona məxsusdur, Ondan başqa ilah yoxdur. O həm dirildir, həm də öldürür. Elə isə Allaha və Onun Elçisinə – yazıb-oxumaq bilməyən,**

**həm də Allaha və Onun kəlmələrinə inanan peyğəmbərə iman gətirin. Onun ardınca gedin ki, bəlkə doğru yola yönələsiniz"** (əl-Əraf, 158). Mötəbər hədisdə *Peyğəmbər ﷺ buyurmuşdur*: "...hər bir peyğəmbər yalnız öz qövmünə göndərilərdi, mən isə bütün insanlara *peyğəmbər* göndərilmişəm..." Hədisi Buxari və Muslim rəvayət etmişdir.[1]

Bu dinin ümumi olduğunu və hamıya şamil edildiyini sübut edən dəlillər bunlardır:

1. Bu dinə etiqad etmək və onun qayda-qanunlarına riayət etmək insanları çətinliyə salmır. Uca Allah buyurur: **"Allah hər kəsi yalnız onun qüvvəsi çatdığı qədər mükəlləf edər"** (əl-Bəqərə, 286). **"Allah sizin üçün çətinlik deyil, asanlıq istəyir"** (əl-Bəqərə, 185). **"O, sizi seçdi və atanız İbrahimin dinində olduğu kimi, bu dində də sizin üçün heç bir çətinlik yaratmadı"** (əl-Həcc, 78). Buxarinin "Səhih" əsərində Səid ibn Əbu Səid əl-Məqbəridən rəvayət edilir ki, Peyğəmbər ﷺ demişdir: "Bu din asandır! Kim bu dini çətinləşdirməyə çalışsa, din onu üstələyər"[2]. Muslimin[3] "Səhih" əsərində Peyğəmbərin ﷺ belə dediyi rəvayət edilmişdir: "Allah üçün ən sevimli din, xalis tək-Allahlıq dinidir!" (həsəndir: Təmamul Minnə)

---

[1] Səhih əl-Buxari, 335; Səhih Muslim, 1191.

[2] Səhih əl-Buxari, 39.

[3] Muslim bu hədisi rəvayət etməmişdir. Hədisi əl-Buxari müəlləq isnadla (yəni isnadının əvvəlindən bir və daha çox ravinin adlarını ardıcıl buraxaraq) rəvayət etmişdir. (Təmamul Minnə 1/45).

2. Bu dində, hökmü dəyişilməyən əqidə və ibadətlə bağlı məsələlər, zaman və məkanın dəyişilməsindən asılı olmayaraq tam təfsilatı ilə izah edilmiş və açıq-aydın dəlillərlə əsaslandırılmışdır. Buna nə isə artırmağa və ya bundan nə isə əskiltməyə heç kəsin qüdrəti çatmaz. Zamanın və məkanın dəyişilməsi ilə hökmü dəyişilən dünyəvi işlər isə müxtəsər və yığcam şəkildə varid olmuşdur ki, ixtiyar sahibləri zəmanəyə uyğun olaraq insanların yaşayış tərzini nəzərə alıb haqq və ədalətlə hökm verə bilsinlər.

3. İslamda olan bütün təlimatlar, dinimizi, nəfsimizi, ağlımızı, nəslimizi və mal-dövlətimizi qorumaq üçündür. Bunun hər zamanda və məkanda fitrətə uyğun olması, insan ağlına və irəliləməyə münasib olması açıq-aydın görünür. Uca Allah buyurur: **“De: “Allahın Öz qulları üçün üzə çıxartdığı zinəti və təmiz ruziləri kim haram etmişdir?” De: “Bunlar dünya həyatında *hamıya*, Qiyamət günü isə yalnız möminlərə məxsusdur”. Biz dərk edən adamlar üçün ayələri belə izah edirik. De: “Rəbbim həm aşkar, həm də gizli *törədilən* yaramaz əməlləri, *hər cür* günahı, haqsızcasına zülm etməyi, Allahın, haqqında heç bir dəlil nazil etmədiyi bir şeyi Ona şərik qoşmağınızı və bilmədiyiniz şeyləri Allahın əleyhinə söyləməyinizi haram buyurmuşdur”** (əl-Əraf, 32-33). **“Bizim üçün bu dünyada da yaxşılıq yaz, axirətdə də. Həqiqətən, biz,**

**Sənə üz tutduq!" *Allah* dedi: "İstədiyimi əzabıma düçar edirəm. Mərhəmətim isə hər şeyi əhatə edir. Mən onu *Allahdan* qorxan, zəkat verən və ayələrimizə iman gətirənlər üçün yazacağam. O kəslər ki, yanlarındakı Tövrat və İncildə haqqında yazılmış olduğunu gördükləri elçinin – yazıb-oxumaq bilməyən peyğəmbərin, ardınca gedərlər. O *peyğəmbər* onlara yaxşı işlər görməyi buyurar, pis əməlləri isə qadağan edər, onlara pak şeyləri halal, murdar şeyləri isə haram edər. Onların ağır yüklərini yüngülləşdirər və onları buxovlardan xilas edər. Ona iman gətirən, onu dəstəkləyən, ona kömək edən və onunla göndərilmiş nurun (Quranın) ardınca gedənlər isə nicat tapanlardır"** (əl-Əraf, 156-157).

## *İslam dəvətinin qayəsi*

İslam dəvətində məqsəd, insanları düzgün tərbiyələndirmək, hamısını Allaha və Ona olan ibadətə yönəltməklə onları günahlardan təmizləmək, insani münasibətləri qüvvətləndirmək və bu münasibətləri sevgi, mərhəmət, qardaşlıq, bərabərlik və ədalət prinsipləri üzərində qurmaqdır. İnsan məhz bunun sayəsində həm bu dünyada, həm də axirətdə xoşbəxtlik tapar. Uca Allah buyurur: **"Savadsızlara özlərindən elçi göndərən Odur. *Elçi* onlara *Allahın* ayələrini oxuyar, onları *pis əməllərdən* təmiz-**

**ləyər, onlara Kitabı və Hikməti (Sünnəni) öyrədər. Halbuki onlar əvvəllər açıq-aydın azğınlıq içində idilər"** (əl-Cumuə, 2). **"Səni də aləmlərə ancaq bir rəhmət olaraq göndərdik"** (əl-Ənbiya, 107). Peyğəmbər ﷺ demişdir: "Mən doğru yol göstərən bir rəhmətəm!"[1]

## *İslam şəriəti: Fiqh*

İslam şəriəti bu dinin əsas tərəflərindən birini – elmi və əməli tərəfini təşkil edir. Şəriət hökmləri Allahın nazil etdiyi vəhydən – Quran və Sünnədən başqa bir şey ola bilməz. Peyğəmbərimizin ﷺ qayəsi təbliğ və izah etmək dairəsindən kənara çıxmamışdır. *Uca Allah buyurur:* **"O, öz istəyi ilə danışmır. Bu, ona təlqin edilən bir vəhydir"** (ən-Nəcm, 3-4).

Siyasət və hərbi əməliyyatlar kimi dünya işləri ilə əlaqəli şəriət məsələlərinə gəldikdə isə Peyğəmbər ﷺ belə işlərdə məsləhət və məşvərət edər və yaxşı məsləhət verildikdə onu dəstəkləyər və ona əməl edərdi. Bədr və Uhud döyüşlərində olduğu kimi. Peyğəmbərin ﷺ əshabələri də həmişə onunla məsləhətləşər, bilmədiklərini ondan soruşar, ayə və hədislərin mənasının açıqlanmasını öyrənmək üçün ona müraciət edər və özlərinin başa düşdüklərini ona bildirərdilər. Peyğəmbər ﷺ də bəzən onların dediklə-

[1] Hədis səhihdir. Silsilətul Əhadis əs-Səhihə, 490.

rini bəyənib təsdiqləyər, bəzən də onların yanlış başa düşdüklərini onlara bildirərdi.

İslam dini müsəlmanlar üçün ümumi qaydalar qoymuşdur ki, *həmin qaydaların* işığını tutub getsinlər. *Bu qaydalar* aşağıdakılardır:

1. Baş verməmiş bir iş barədə – o iş baş verincəyə qədər sual verməyin qadağan olunması: Uca Allah buyurur: **"Ey iman gətirənlər! Sizə agah olunca xoşunuza gəlməyəcək şeylər barəsində soruşmayın. Əgər Quran nazil edildiyi zaman onlar haqqında soruşsanız, sizə aydın olar. Allah bunları (indiyə qədər verdiyiniz bu cür sualları) əfv etdi. Allah Bağışlayandır, Rəhmlidir"** (əl-Maidə, 101). Hədisdə isə belə deyilir: "Peyğəmbər ﷺ baş verməmiş işlər barədə soruşmağı qadağan etmişdir".[1]

2. Çox sual vermək və qarmaqarışıq məsələləri ortaya atmaqdan çəkinmək: Peyğəmbər ﷺ demişdir: "Allah sizə *üç şeyi* qadağan etmişdir; dedi-qodu yaymağınızı, çox sual verməyinizi və malı israf etməyinizi".[1] Başqa hədisdə isə belə demişdir: "Allah bəzi əməlləri vacib buyurmuşdur, onları tərk etməyin; hüdudlar qoymuşdur, onları aşmayın; bəzi şeyləri haram etmişdir, onları çeynəməyin; bəzi şeylər haqqında – onları unutmadan, sizlərə rəhmət

---

[1] Hədis zəifdir. Təmamul Minnə, 1/45.

olsun deyə susmuşdur, onları araşdırmayın."[2] Başqa bir hədisdə də belə buyurmuşdur: "Müsəlmanlar arasında ən böyük günahkar o kimsədir ki, o, haram buyurulmamış şey barəsində soruşsun və buna görə də *soruşduğu şey müsəlmanlara* haram buyurulsun."[3]

3. Dində ixtilafa girməkdən və firqələrə bölünməkdən uzaq olmaq: Uca Allah buyurur: **"Həqiqətən, bu, vahid bir din olaraq sizin dininizdir. Mən də sizin Rəbbinizəm. Elə isə Məndən qorxun. Lakin onlar öz dinini aralarında parçalayıb firqələrə böləndülər. Hər firqə öz təriqətinə sevinir"** (əl-Muminun, 52-53). **"Hamınız Allahın ipindən möhkəm yapışın və parçalanmayın!"** (Ali-İmran, 103). **"Allaha və Onun Elçisinə itaət edin, bir-birinizlə mübahisə etməyin, yoxsa ruhdan düşər və zəifləyərsiniz. Səbir edin, çünki Allah səbir edənlərlədir"** (əl-Ənfal, 46). **"Dinlərini parçalayıb firqə-firqə olanlarla sənin heç bir əlaqən yoxdur. Onların işi Allaha aiddir. Sonra *Allah* onlara etdikləri əməllər barədə xəbər verəcəkdir"** (əl-Ənam, 159). **"Özlərinə aydın dəlillər gəldikdən sonra firqələrə ayrılıb ixtilaf edənlər kimi olmayın. Onları böyük bir əzab gözləyir"** (Ali-İmran, 105).

---

[1] Səhih əl-Buxari, 1477; Səhih Muslim, 4582.

[2] Hədis zəifdir. Mişkatul Məsabih, 1/42.

[3] Səhih əl-Buxari, 7289; Səhih Muslim, 6265.

4. İxtilaflı məsələləri Kitab və Sünnəyə qaytarmaq: Uca Allah buyurur: **“Əgər bir şey haqqında mübahisə etsəniz, Allaha və Axirət gününə inanırsınızsa, Allaha və *Onun* Elçisinə müraciət edin. Bu, *sizin üçün* daha xeyirli və nəticə etibarilə daha yaxşıdır”** (ən-Nisa, 59). **“İxtilafa düşdüyünüz şeylər barəsində hökm vermək ancaq Allaha aiddir”**(əş-Şura, 10). Çünki din artıq hər şeyi təfsilatı ilə izah etmişdir. **“Biz Kitabı sənə hər şey üçün bir izah, müsəlmanlara da doğru yolu göstərən rəhbər, mərhəmət və müjdə olaraq nazil etdik”** (ən-Nəhl, 89). **“Biz Kitabda heç bir şeyi nəzərdən qaçırmadıq”** (əl-Ənam, 38). **Sünnə də bunu təsdiqləyir: “*Biz onları* aydın dəlillər və kitablarla *göndərdik*. Sənə də Zikri nazil etdik ki, insanlara, onlara nazil olanı izah edəsən və bəlkə onlar fikirləşələr”** (ən-Nəhl, 44). **“Həqiqətən, Biz sənə Kitabı haqq olaraq nazil etdik ki, insanlar arasında Allahın sənə vəhy etdiyi ilə hökm verəsən”** (ən-Nisa, 105). Beləliklə də, Onun əmri yerinə yetirildi və ayələri müfəssəl şəkildə izah olundu. Uca Allah buyurur: **“Bu gün dininizi sizin üçün kamil etdim, sizə olan nemətimi tamamladım və bir din olaraq sizin üçün İslamı bəyənib seçdim”** (əl-Maidə, 3).

Dini məsələlər beləcə açıq-aydın bəyan edildiyi və hökm vermək üçün istinad ediləcək mənbənin bəlli oldu-

ğu bir halda ixtilaf etməyin mənası və yeri yoxdur. Uca Allah buyurur: **"Kitab barəsində ixtilaf edənlər isə, əlbəttə, *haqdan* uzaq bir ziddiyyət içindədirlər"** (əl-Bəqərə, 176). **"Xeyr! Sənin Rəbbinə and olsun ki, onlar öz aralarında baş verən çəkişmələrdə səni hakim hesab etməyincə, sonra da verdiyin hökmlərə görə özlərində bir sıxıntı duymadan tam təslim olmayınca iman gətirmiş olmazlar"** (ən-Nisa, 65).

Hər zaman gözəl xatirələrlə yad edilən əshabələr və onların yolunu tutub gedənlər də bu qaydaların işığında getmişlər. Bəzi məsələlər istisna olmaqla onların arasında heç vaxt ixtilaf olmamışdır. *Bu ixtilafların olması* ona görə idi ki, onların dəlilləri başa düşmək qabiliyyəti fərqli idi, həm də bəzilərinin bildiyi hədisləri digərləri bilmirdi.

Dörd məzhəb imamlarına gəlincə, onlar da özlərindən əvvəl gəlib getmiş sələflərinin yolu ilə getmişlər. Lakin hicazlılar Sünnəyə daha yaxın olmuş, onların arasında hədisləri və rəvayətləri əzbər bilənlərin sayı daha çox olmuşdur. İraqlılar və digərləri isə rəyə üstünlük vermişlər. Çünki onlar vəhy nazil olmuş bir diyardan uzaqda yaşamış və aralarında hədis bilənlərin sayı az olmuşdur. Bu imamlar öz sağlıqlarında dini insanlara başa salmaq və onları düzgün istiqamətləndirmək üçün əllərindən gələni əsirgəməmişlər. İmamlar insanlara onları təqlid etməyi

qadağan edib deyərdilər: “Bizim dəlilimizi bilmədən sözümüzü demək heç kəsə caiz deyildir!” Onlar məzhəblərinin “səhih hədis” olduğunu açıq-aydın bildirmişdilər. Belə ki, onların məqsədi Peyğəmbər ﷺ kimi təqlid olunmaq deyil, sadəcə Allahın hökmlərini insanlara başa salmaq olmuşdur. Lakin sonrakı nəsillərin cidd-cəhdləri azalmış, iradələri zəifləmiş və beləliklə də, hekayələr danışmağa və təqlid etməyə meyl göstərmişlər. Beləcə, hər bir camaat özünün doğru hesab etdiyi müəyyən bir məzhəbi qəbul etməklə kifayətlənmiş, ancaq ona etimad edib kor-koranə olaraq ona bağlanmış, məzhəbinin üstün olması üçün əllərindən gələni etmiş və imamlarının sözlərini Allahın və Peyğəmbərinin sözlərinə bərabər tutmuşlar. Habelə hər hansı bir məsələdə imamın rəyinə müxalif fətva verməyi caiz hesab etməmişlər. Bu imamlara inam o dərəcəyə gəlib çatmışdır ki, nəhayət Kərhi demişdir: “Alimlərimizin dediyinə zidd olan hər bir ayə və hədis ya mənsuxdur (hökmü ləğv edilmişdir), ya da başqa mənaya yozulmuşdur.” Müsəlmanlar məzhəbləri təqlid edib kor-koranə onlara tabe oldular deyə, Quran və Sünnə sayəsində doğru yola yönəlməkdən məhrum oldular. *O dövrdə:* “İctihad[1]

[1] [Dini qanunları və əhkamları təfsir və şərh etmək səlahiyyətinə malik din xadimlərinin əhkam və hadisələrdən məna, hökm çıxarması və çıxardığı məna.]

qapısı bağlıdır!" şüarı meydana çıxdı və şəriət, fəqihlərin[1] sözləri, fəqihlərin sözləri də, şəriət qəbul edildi. O zamanlar fəqihlərin sözündən çıxanları, dediklərinə güvənilməyən və fətvaları keçərli olmayan bidətçi[2] hesab edirdilər. Bu yanlış təbliğatın yayılmasına, ixtiyar sahiblərinin və zəngin adamların tikdirdikləri mədrəsələr və bu mədrəsələrdə bir məzhəbin yaxud müəyyən məzhəblərin tədrisi də yardım etmişdir. Bu, *müəllimlərin,* özləri üçün təyin edilmiş maaşları qorumaq məqsədilə ictihad etməkdən üz çevirib məzhəbləri təqlid etməyinə səbəb olmuşdur.

Əbu Zur'a şeyxi Bulqinidən soruşdu: "Nə üçün şeyx Təqiyyuddin Subki ictihadın açarlarını təkmilləşdirdiyi bir halda ictihad etməkdən çəkinmişdir?" Bulqini susdu. Əbu Zur'a dedi: "Məncə, onun ictihaddan imtina etməsi, dörd məzhəb üzərində olan fəqihlərin tutduqları vəzifələrə görə olmuşdur. Çünki *həmin dövrdə* məzhəbdən kənara çıxanlara vəzifə verilmir, özləri də hökm vermək hüququndan məhrum olurdular. Üstəlik insanlar onlardan fətva almaqdan çəkinir və onları bidətçi adlandırırdılar". Bulqini gülümsəyərək onun sözünü təsdiqlədi.

---

[1] [Quran və hədislərə əsaslanaraq şəriət əhkamlarından anlayışı olan din xadimi.]

[2] [Bidət: Peyğəmbərin ﷺ zamanında olmayıb sonradan meydana gələnmiş "ibadət"dir. «Nihayə fi Ğəribil Hədis» 4/52; «Ğəribul-Hədis» 2/295.]

Təqlidə bənd olub, Kitab və Sünnənin rəhbərliyini itirdikdən sonra, "İctihad qapısı bağlıdır!" sözü ilə Muhəmməd ﷺ ümməti bəlalara düçar oldu və nəhayət Peyğəmbərin ﷺ çəkindirdiyi kərtənkələ yuvasına girdi.[1] Bu təqlidin nəticəsi belə oldu ki, ümmət dəstələrə və firqələrə bölündü, hətta iş o yerə gəlib çatdı ki, hənəfi məzhəbində olan kimsənin şafii məzhəbində olan kimsə ilə evlənməsində ixtilafa düşdülər. Bəziləri: "*Bu,* mötəbər deyildir, çünki şafiilər imanlarında şəkk[2] edirlər"- dedilər. Digərləri isə: "*Bunu* qeyri müsəlmanla evlənməyin caiz olmasına qiyas edib mötəbər hesab etmək olar"- dedilər. Bu təqlidin nəticəsi idi ki, bidətlər yayıldı, Sünnənin əlamətləri ört-basdır edildi, ağıldan istifadə etməyə imkan verilmədi, azad fikirdə olmağın qarşısı alındı və ümmətin mənliyini alçaldacaq bir şəkildə elm azadlığı aradan qaldırıldı. Beləcə bu ümmətin həyatda nəticələr əldə etməyinə və inkişaf edib ayağa qalxmasına mane oldular. Bunun sayəsində əcnəbilər boşluqlar tapıb İslamın içinə girməyə baş-

---

[1] [Əbu Səid əl-Xudri rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Siz özünüzdən əvvəlkilərin yolunu tutub qarış-qarış, dirsək-dirsək gedəcəksiniz. Onlar kərtənkələ yuvasına girsələr belə, siz də girəcəksiniz." Əshabələr ondan: "Kitab əhlini deyirsən, ya Rəsulallah?"- deyə soruşdular. O: "Başqası da varmı?!"- deyə cavab verdi". Səhih əl-Buxari, 3456; Səhih Muslim, 6952.]

[2] Çünki Şafiilər müsəlmanın: "Mən möminəm inşa Allah!"- deməsinə icazə verirlər.

ladılar. İllər keçdi, əsrlər bitti. Uca Allah bu ümmətə hər zaman dinini təzələyən (onu düzgün şəkildə təbliğ edən), onları yuxudan oyadan və doğru yola istiqamətləndirən kişilər göndərdi. Lakin bu kişilər ümməti oyatdıqdan sonra onlar yenə əvvəlki vəziyyətlərinə qayıdır və ya bundan da çox azğınlaşırdılar. Nəhayət Allahın, bütün insanların həyatını nizama salan, dünya və axirət həyatları üçün bir vasitə olan İslam qayda-qanunları, misli görünməmiş səviyyəyə endi, çox dərin bir çuxura düşdü. Onunla məşğul olmaq ağılı və qəlbi korlamağa, vaxtı aparmağa başladı. Artıq İslam şəriəti Allahın dininə fayda verməz və insanların həyatını nizama salmaz bir hala düşdü.

Müasir fəqihlərdən birinin yazdığı misala bir baxın: "İbn Ərafa icarəni tərif edib demişdir: "Gəmidən və öyrədilmiş heyvanlardan başqa daşınması mümkün olan *şeylərin* mənfəətini, qarşılığı ödənilməklə satmaqdır. *Ödənilən* bu qarşılıq onun özündən əmələ gəlməməli və bu qarşılığın bəzisi mənfəətin bəzisini əvəz edəcək şəkildə olmalıdır". Şagirdlərindən biri ona etiraz edərək, buradakı "bəzi" kəlməsinin, tərifin qısa olmasına zidd olduğunu, onun qeyd edilməsinə lüzum olmadığını bildirdi. Şeyx iki gün düşündükdən sonra "bəzi" kəlməsinin tərifə aidiyyəti olmadığına qərar verdi.

Şəriət məsələləri bu nöqtədə dayandı. Alimlər, mətnlərdən başqa ortaya bir şey qoya bilmədilər; haşiyələrdən və haşiyələrdəki sitatlardan, etirazlardan, müəmmalı sözlərdən və bunlara dair yazılan cavablardan başqa bir şey bilmədilər. Nəhayət, qərb əhli əllərilə şərqi idarə etməklə onları üstələməyə başladı. *Şərq* bu zərbələrdən oyanıb sağına və soluna baxmaq əvəzinə gəldi-gedər dünyanın dalına düşdü, durmadan gedən karvanın önündə oturmağa davam etdi. O özünün kamil həyat, qüvvət və inkişaf içində olduğunu düşündü. Gördüyü şeylər ona xoş gəldi, onu valeh etdi. Tarixini inkar edib əcdadlarına qarşı çıxanlar, dinini və adət-ənənələrini unudanlar qışqırıb dedilər: "Ey şərqlilər! Budur Avropa! Onların yolunu gedin, yaxşı və yaman işlərdə, iman və küfrdə, şirin və acı hər şeydə onları təqlid edin!" Əqidələrində sabitqədəm olanlar möhkəm dayanıb "Lə həulə və lə quvvətə illə billəh *(Qüdrət və güc yalnız Allahdadir!)*" və "İnnə lilləhi və innə ileyhi raciun *(Biz, Allaha məxsusuq və Ona da qayıdacağıq!)*" deyərək *cəmiyyətdən qaçıb* qaradinməz evlərinə çəkildilər. Bu hal, avamların əlində, İslam şəriəti – müasir dövrün inkişafına uyğun gəlmir və zamanla ayaqlaşmır kimi yanlış qənaətə dair digər bir əsasa çevrildi. Qərb mədəniyyəti, dininin və adət-ənənələrinin İslama zidd olmasına baxmayaraq şərqi idarə edəcək bir hala gəlib çatdı. Qərb mə-

dəniyyəti evləri, küçələri, klubları, məktəbləri və universitetləri bürüdü. Hər bölgədən dəstək alaraq qalibiyyətlər əldə etməyə başladı. Şərq az qala dinini və adətlərini unudacaq hala gəlib çatdı. Keçmişi ilə hazırki dövrü arasında olan bağları kəsdi. Lakin yer üzündə həmişə, Allahın dininə dəlil-sübutla dəvət edən şəxslər olub və olacaq da. İslam dəvətçiləri qərblilərin toruna düşmüş kimsələri çəkindirib dedilər: "Ehtiyatınızı əldən verməyin! Onların təbliğatından özünüzü qoruyun." Qərblilərin pis əxlaqı, əlbəttə ki, onlar üçün çox pis aqibətlə nəticələnəcəkdir. Fitrətlərini dürüst imanla düzəltməyincə, yüksək əxlaq nümayiş etdirib təbiətlərini dəyişdirməyincə, qərblilərin bildiyi elm yaxın zamanda alt-üst olacaq, mədəniyyətləri isə onları atəşə sürükləyib hər tərəfdən bürüyəcək və nəhayət barələrində son hökm veriləcəkdir. Uca Allah buyurur: **"Məgər görmədinmi ki, Rəbbin nələr etdi Ad** ***qövmünə*****, sütunlar sahibi İrəm** ***qəbiləsinə*** **– halbuki, yer üzündə onlar kimisi xəlq edilməmişdi.** ***Habelə*** **vadidə qayaları yonan Səmud** ***qövmünə*****? Eləcə də sütunlar sahibi Firona? Onlar o kəslər idi ki, ölkələrində həddi aşmış, çoxlu fitnə-fəsad törətmişdilər. Rəbbin də onları əzabla qamçıladı. Həqiqətən, sənin Rəbbin nəzarət edir"** (əl-Fəcr, 6-14). Halbuki haqqa dəvət edənlər donub qalmış bu insanları doğru yola və saf əqidəyə çağırıb deyirdilər:

“Gəlin, Kitab və Sünnəyə istinad edin! Dininizi yalnız bu iki mənbədən götürün! Başqalarını da bu ikisi ilə müjdələyin! Belə olduğu təqdirdə, bizi çaşdıran dünya həyatı sizin vasitənizlə hidayətə yetişəcək və əzab çəkən insanlar sizin əlinizlə xoşbəxt olacaqlar”. Uca Allah buyurur: **“Allahın Elçisi sizlərə – Allaha və Axirət gününə ümidini bağlayanlara və Allahı çox zikr edənlərə gözəl nümunədir”** (əl-Əhzab, 21).

Allahın lütfüdür ki, insanların çoxu bu dəvəti gözəl qarşılayır, səmimi qəlblər onu qəbul edir, gənclər onu qucaqlayaraq canlarını və sahib olduqları var-dövlətin ən qiymətlisini bu yolda fəda edirlər. Görəsən, Allah Öz nurunun yer üzünü təzədən işıqlandırmasına izn verəcəkmi? İnsana, iman, sevgi, yaxşılıq və ədalətlə dolu olan gözəl bir həyat bəxş edəcəkmi? Cavabı isə bu ayələrdədir: **“*İslamı* bütün dinlərdən üstün etsin deyə Öz Elçisini hidayətlə və həqiqi dinlə göndərən Odur. Şahid kimi Allah kifayətdir”** (əl-Fəth, 28). **“*Quranın* haqq olduğu onlara aydın olana qədər, Biz dəlillərimizi onlara həm kainatda, həm də onların özlərində mütləq göstərəcəyik. Məgər Rəbbinin hər şeyə şahid olması kifayət deyil?”** (Fussilət, 53).

# TƏHARƏT

## Su və onun növləri

### – birinci növü: təbii su

Pak hökmündədir. Yəni həm özü təmizdir, həm də başqasını təmiz edə bilir. Onun da aşağıdakı qisimləri mövcuddur.

**1. Yağış, qar və buz suyu.** Uca Allah buyurur: ***"...göydən sizin üzərinizə yağmur endirmişdi ki, onunla sizi təmizləsin...",[1] "Biz göydən tərtəmiz su endirdik"[2].***

Əbu Hureyranın ﵁ rəvayət etdiyi hədisdə deyilir: "Peyğəmbər ﷺ namazda təkbir etdikdən sonra bir müddət susdu. Ondan: "Atam-anam sənə fəda olsun, ey Allahın elçisi! Sən təkbirlə qiraət arasında nə oxuyursan?"– deyə soruşdum. O dedi: "Deyirəm: "Allahım, məşriqlə məğribi bir-birindən uzaq etdiyin kimi məni də günahlardan uzaq tut. Allahım! Ağ libası ləkədən təmizlədiyin kimi məni də xətalardan təmizlə. Allahım! Mənim xətalarımı qar, su və

[1] "əl-Ənfal" surəsi, 11.
[2] "əl-Furqan" surəsi, 48.

dolu ilə yu”.[1] Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir.

**2. Dəniz suyu.** Əbu Hureyra ﷺ rəvayət edir ki, bir kişi Peyğəmbərə ﷺ sual verib dedi: “Ey Allahın elçisi biz dənizə çıxırıq və özümüzlə az miqdarda su götürürük. Əgər onunla dəstəmaz alsaq, içəcək suyumuz qalmayacaq. *Belə olduğu halda* dənizin suyu ilə dəstəmaz ala bilərikmi?” Peyğəmbər ﷺ dedi: “Onun suyu təmiz, ölmüş heyvanları isə halaldır”. Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi, ibn Macə rəvayət etmiş və Tirmizi demişdir: “Bu hədis həsən səhihdir və mən Muhəmməd ibn İsmail əl-Buxaridən bu hədis barədə soruşdum. Dedi ki, hədis səhihdir”.[2]

**3. Zəm-zəm suyu.** Əlinin ﷺ rəvayət etdiyi hədisdə deyilir: “Peyğəmbər ﷺ bir dolu vedrə zəm-zəm suyu istədi. Ondan bir az içib sonra da dəstəmaz aldı”. Hədisi Əhməd rəvayət etmişdir.[3]

---

[1] Ərəbcəsi:

(( اللَّهُمَّ بَاعِدْ بَيْنِي وَبَيْنَ خَطَايَايَ كَمَا بَاعَدْتَ بَيْنَ الْمَشْرِقِ وَالْمَغْرِبِ، اللَّهُمَّ نَقِّنِي مِنْ خَطَايَايَ كَمَا يُنَقَّى الثَّوْبُ الْأَبْيَضُ مِنَ الدَّنَسِ، اللَّهُمَّ اغْسِلْنِي مِنْ خَطَايَايَ بِالثَّلْجِ وَالْمَاءِ وَالْبَرَدِ ))

Transkripsiyası: Allahummə, bəid bəyni və bəynə xatayayə kəmə bəadtə bəynəl-məşriqi vəl-məğribi, Allahummə, nəqqini min xatayayə kəmə yunəqqəs-səubul-əbyədu minəd-dənəsi. Allahumməğsilni min xatayayə bis-səlci vəl-mai vəl-bərədi.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 76.

[3] Hədis həsəndir və bu rəvayət Əhmədin deyil, onun oğlu Abdullahın atasının kitabına etdiyi əlavədir. Təmamul Minnə, 1/76.

**4. Uzun müddət bir yerdə qalmaq səbəbi ilə, yaxud adətən suyun içində rast gəlinən yosun, ağac yarpağı və s. ilə keyfiyyəti dəyişmiş su.** Alimlərin yekdil rəyinə görə bu da təbii su adlanır.

Bu fəslin məğzi ondan ibarətdir ki, təbii su adlanan su ilə dəstəmaz və qüsl almaq olar. Uca Allah buyurur: **"... su tapmasanız, təmiz torpaqla təyəmmüm edin və ondan üzünüzə və əllərinizə sürtün..."**[1]

**– ikinci növü: istifadə olunmuş su**

Bu da qüsl və ya dəstəmaz zamanı əzalardan süzülüb tökülən suya deyilir. Onun hökmü də eyni ilə təbii suyun hökmü kimi əslinə görə təmizdir. Bu suyun təmiz olmamağına heç bir dəlil yoxdur. Rəbiyyə bint Muavviz ﵂ rəvayət etdiyi hədisində Peyğəmbərin ﷺ dəstəmaz almasını vəsf edərək demişdir: "O, əllərində qalan dəstəmaz suyu ilə başına məsh çəkdi". Hədisi Əhməd və Əbu Davud rəvayət etmişdir. Əbu Davudun rəvayətində: "Peyğəmbər ﷺ əlindəki su ilə başına məsh çəkdi" deyilir.[2] Əbu Hureyra ﷺ rəvayət edir ki, bir gün o, cənabətli olduğu halda Mədinənin küçələrindən birində Peyğəmbərlə ﷺ rastlaşdı. Peyğəmbərdən ﷺ aralanıb getdi, sonra da qüsl alıb geri qayıtdı. Peyğəmbər ﷺ: "Harada idin, ey Əbu Hureyra?"-

---

[1] "əl-Maidə" surəsi, 6.

[2] Hədis həsəndir. Səhih Əbu Davud, 121.

deyə soruşdu. *Əbu Hureyra*: "Cənabətli idim. Odur ki, təmiz olmadığım halda sənin yanında oturmaq istəmədim"- deyə cavab verdi. Peyğəmbər ﷺ dedi: "Subhanəllah! Mömin murdar olmaz"- dedi." Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Hədisdən aydın olur ki; əgər mömin murdar deyildirsə, deməli, onun toxunduğu suyun natəmiz olduğunu da qəbul etməyə heç bir əsas yoxdur. Çünki təmiz vücud təmiz suya toxunmuşdur. Təmiz vücud isə suyun təmizliyini aradan qaldırmaz. İbn Munzir demişdir: "Əli, ibn Ömər, Əbu Umamə, Əta, Həsən, Məkhul və Nəxəidən rəvayət edilir ki, onlar belə demişlər: "Başına məsh çəkməyi unudub saqqalının yaş olduğunu görən kimsəyə, əllərini saqqalına sürtüb sonra başına məsh etməsi kifayət edər". Bu da, onların istifadə olunmuş suyu təmiz hesab etmələrinə dəlalət edir. Mən də bu rəyi dəstəkləyirəm. Bu rəy Malik və Şafiidən gələn rəvayətlərdən biridir. İbn Həzm, Süfyan əs-Sövrinin, Əbu Sövrün və bütün zahirilərin bu fikirdə olduğunu demişdir.

**– üçüncü növü: tərkibinə sabun, zəfəran, un və başqa bu kimi əşyalar qatışmış su**

Bu su, təbiiliyində qaldıqca təmiz sayılır. Elə ki, təbiiliyini itirdi və su adı onun üstündən götürüldü, özünün

təmizliyi qalsa da, başqasını təmizləməyə yararlı olmur. Rəvayət edilir ki, Ummu Ətiyyə əl-Ənsariyyə ﵂ demişdir: "Peyğəmbərin ﷺ qızı *Zeynəb* vəfat etdikdə Peyğəmbər ﷺ bizim yanımıza gəlib dedi: "Onu üç və ya beş yaxud məsləhət bilirsinizsə, bundan da çox su və sidr[1] ilə yuyun. Axırıncısına kafur[2] da qatın. İşinizi bitirdikdən sonra mənə xəbər verin." Biz *onu yuyub* qurtardıqdan sonra Peyğəmbərə ﷺ xəbər verdik. O, izarını[3] bizə verib dedi: "Onu buna sarıyın!" Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Qeyd etmək lazımdır ki, ölü də, diri kimi təmiz su ilə yuyulmalıdır. Əhməd, Nəsai və ibn Xuzeymənin nəql etdiyi hədisdə Ummu Hani ﵂ rəvayət etmişdir ki, Peyğəmbər ﷺ zövcəsi Meymunə ilə bərabər bir qabdan su götürərək qüsl etdi. O qabın içində xəmirin qalıqları qalmışdı".[4] Hər iki hədisdə suya təmiz şeylərin qatışdığı bildirilir; lakin bu qatışıq suyu təbiiliyindən çıxaracaq miqdarda olmamışdır.

**– dördüncü növü: tərkibinə murdar şeylər qatışmış su**

Suyun murdar şeylə dəyişilməsinin iki halı vardır:

---

[1] Şam fəsiləsindən həmişəyaşıl, iynəyarpaqlı ağacdır.

[2] Dəfnəkimilər fəsiləsindən həmişəyaşıl ağacdır.

[3] İzar – qurşaqdan aşağı olan bədən əzalarını örtmək üçün belə bağlanılan örtük.

[4] Hədis səhihdir. İrvaul Ğəlil, 1/64.

Birincisi: murdar şeyin, suyun ya dadını, ya rəngini, ya da qoxusunu dəyişdirməsidir. Bu halda həmin su ilə yuyunmaq, icmanın *İslam alimlərinin yekdil rəyinə əsasən* caiz deyildir.

İkincisi: Suyun təbiiliyinin olduğu kimi qalması, onun üç vəsfindən birinin dəyişilməməsidir. Bu su, az və ya çox olmasından asılı olmayaraq həm özü təmizdir, həm də başqasını təmiz edə bilir.

Əbu Hureyranın ﵁ rəvayət etdiyi hədis buna dəlildir. O demişdir: "Bir bədəvi gəlib məscidə sidik ifraz etdi. Camaat qalxıb onu tənbeh etdikdə Peyğəmbər ﷺ dedi: "Buraxın onu! Sidiyinin üzərinə də bir vedrə (və ya bir çəllək) su tökün. Siz çətinləşdirən deyil, asanlaşdıran olaraq göndərildiniz." Hədisi Əhməd, Buxari, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

Əbu Səid əl-Xudri rəvayət edir ki, Peyğəmbərdən ﷺ: "Ey Allahın elçisi! Biz Budaə quyusundan dəstəmaz ala bilərikmi?"- deyə soruşdular. O dedi: "Su təmizdir, onu heç bir şey murdar etməz!" Hədisi Əhməd, Şafii, Əbu Davud, Nəsai, Tirmizi rəvayət etmiş və Tirmizi onun həsən olduğunu demişdir. Əhməd isə belə demişdir: "Budaə quyusu barəsindəki hədis səhihdir. Onu Yəhya ibn Məin və Əbu Muhəmməd ibn Həzm səhih hesab etmişdir."[1] İbn

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 66.

Abbas, Əbu Hureyra, Həsən əl-Bəsri, ibn Museyyib, İkrimə, ibn Əbu Leyla, əs-Sövri, Davud əz-Zahiri, Nəxəi, Malik və digərləri də bu fikirdə olmuşlar. Qəzali demişdir: "İstərdim ki, sular fəslində Şafii məzhəbi Maliki məzhəbi kimi olsun." Abdullah ibn Ömərdən rəvayət olunan hədisə gəldikdə, Peyğəmbər ﷺ demişdir: "Su iki qüllə[1] olsa, murdarlanmaz!" Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Bu hədis müxtəlif yollarla bir-birinə zidd olan mətnlər və isnadlarla rəvayət olunmuşdur.[2] İbn Abdulbərr Təmhid əsərində demişdir: "Şafiinin "qülləteyn" hədisinə əsasən yürütdüyü rəy nəzəri cəhətdən zəif, rəvayət baxımından isə qeyri-sabit hesab edilir".

**– beşinci növü: artıq qalmış su**

Artıq: içildikdən sonra qabda qalan sudur. Bu da bir neçə növdür:

**1. İnsanın artığı.** İstər müsəlman, istər də kafir olsun; istər cünub halında, istərsə də heyzli olsun – insan artığı təmizdir. Uca Allahın: **"Həqiqətən, müşriklər murdardırlar"**[3] ayəsinə gəldikdə isə, burada müşriklərin özləri və

---

[1] İki qüllə təqribən iki tuluq yarım suyun misli qədərdir. Bu da təxminən beş yüz iraq rətlinə bərabərdir. Bir İraq rətli 90 misqala; bir misqal 4,25 qrama bərabərdir. Deməli, bir İraq rətli 382,5 qrama bərabərdir. Buna əsasən demək olar ki, iki qüllə 191250 qrama bərabərdir. Zadul Mustəqna, 1/43

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 65.

[3] "ət-Tovbə" surəsi, 28.

vücudları deyil, batil etiqadları üzündən, üstəlik də yaramaz və murdar əməllərə son qoymadıqlarına görə, mənəviyyatlarının murdar olduğu qəsd edilir. O zaman müşriklər müsəlmanların arasında gəzib dolaşır, onların elçiləri və nümayəndələri Peyğəmbərin ﷺ yanına gəlir və onun məscidinə daxil olurdular. Bununla belə, Peyğəmbər ﷺ onların bədənlərinin dəydiyi yeri yumağı əmr etməzdi. Aişə رضي الله عنها belə rəvayət etmişdir: "Mən heyzli ikən, qabdan su içər, sonra da o qabı Peyğəmbərə ﷺ verərdim. O da ağzını mənim ağzımın dəydiyi yerə qoyub su içərdi". Hədisi Muslim rəvayət etmişdir.

**2. Əti yeyilən heyvanların artığı.** Bu artıq təmizdir. Belə ki, onun ağzının suyu təmiz ətdən əmələ gəldiyi üçün ətin hökmünü götürür. Əbu Bəkr ibn Munzir demişdir: "Elm əhli ittifaq etmişdir ki, əti yeyilən heyvanların artığından içmək və onunla dəstəmaz almaq olar!"

**3. Qatır, uzunqulaq, yırtıcı heyvanlar və yırtıcı quşların artığı.** Bu artıq təmizdir. Cabir رضي الله عنه rəvayət edir ki, Peyğəmbərdən ﷺ: "Eşşəyin artığı ilə dəstəmaz almaq olarmı?"- deyə soruşdular. O buyurdu: "Bəli, *siz həm onunla, həm də* bütün yırtıcı heyvanların artığı ilə *dəstəmaz ala bilərsniz*." Hədisi Şafii, Daraqutni və Beyhəqi rəvayət etmişdir. Beyhəqi demişdir: "Hədisin isnadları bir-birilə əlaqə-

ləndirilsə etibarlı sayıla bilər".[1] İbn Ömər ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ gecə vaxtı *səhabələri ilə birlikdə* səfərə çıxdı və gəlib hovuzun kənarında oturan bir kişinin yanından keçdilər. Ömər ﵁ *o kişidən*: "Bu gecə yırtıcı heyvan ağzını sənin hovuzuna soxubmu?"- deyə soruşdu. Peyğəmbər ﷺ dedi: "Ey hovuz sahibi! Ona heç nə demə, bu, çətinlik axtaran adamdır. Hovuzun içində olan hovuza, qalanından içmək və təmizlənmək isə bizə aiddir." Hədisi Daraqutni rəvayət etmişdir.[2] Yəhya ibn Səid rəvayət edir ki, Ömər ﵁, aralarında Amr ibn As olan bir dəstə adamla səfərə çıxdı. Nəhayət bir hovuzun yanına gəlib çatdıqda Amr ﵁: "Ey hovuz sahibi! Vəhşi heyvanlar sənin hovuzundan su içirlərmi?"- deyə soruşdu. Ömər ﵁ dedi: "Bizə heç nə demə! Çünki biz yırtıcı heyvanların yanına gedir, onlar da bizim yanımıza gəlirlər." Hədisi Malik Muvatta əsərində rəvayət etmişdir.[3]

**4. Pişiyin artığı.** Bu artıq təmizdir. Kəbşə bint Kəb ﵂ rəvayət edir ki, əri Əbu Qətadə ﵁ onun yanına gəldikdə, dəstəmaz almaq üçün su hazırladı. Bu vaxt bir pişik gəlib o sudan içmək istədikdə Əbu Qətadə ﵁ qabı ona uzatdı və pişik o sudan içdi. Əbu Qətadə ﵁ mənim ona baxdığı-

[1] Hədis zəifdir. Təmamul Minnə, 1/47.
[2] Hədis zəifdir. Təmamul Minnə, 1/48.
[3] Hədis zəifdir. Təmamul Minnə, 1/48.

mı gördükdə dedi: "Təəccübmü edirsən, ey qardaşım qızı?" Mən: "Bəli!"- deyə cavab verdikdə, o dedi: "Pişik murdar deyildir. O, ətrafınızda gəzib dolaşanlardan biridir". Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi bu hədisin "həsən-səhih" olduğunu demişdir. Hədisi Buxari və digərləri də mötəbər saymışlar.[1]

**5. Donuzun və itin artığı.** Bu artıq murdardır və ondan çəkinmək vacibdir. İtin artığına dair Buxari və Muslimin Əbu Hureyradan ﷺ rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ buyurmuşdur: "İt, sizdən birinizin qabından su içsə, qoy o qabı yeddi dəfə yusun". Əhməd və Muslimin rəvayətində isə belə demişdir: "İt, sizdən birinizin qabından su içsə, o qabı, birincisini torpaqla yumaq şərtilə yeddi dəfə yumaq lazımdır." Donuzun artığına gəldikdə isə, bu, onun özünün murdar və napak olmasına görədir.

## Nəcasət

**Nəcasət:** müsəlmanın qaçınması vacib olan və dəydiyi yerin yuyulması lazım gələn murdar şeydir. Uca Allah buyurur: **"Geyimini təmiz saxla!"**[2] **"Şübhəsiz ki, Allah**

---

[1] Hədis həsən-səhihdir. Səhih Əbu Davud, 74.

[2] "əl-Muddəssir" surəsi, 4.

**tövbə edənləri də sevir, pak olanları da."**[1] Peyğəmbər ﷺ buyurmuşdur: "Təmizlik imanın yarısıdır!"[2]

Buna dair məsələlər aşağıdakılardır:

## Nəcasətin növləri[3]

**1. Leş.** Bu, boğazı kəsilmədən ölmüş heyvandır. Canlı heyvandan kəsilmiş bir tikə də leş hökmündədir.

Əbu Vaqid əl-Leysi ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Heyvan diri ikən ondan kəsilib götürülmüş tikə ölü sayılır". Hədisi Əbu Davud və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədisi həsən hesab edərək: "Elm əhli buna əməl etməkdədir"- demişdir.[4]

Bundan istisna olanlar aşağıdakılardır:

a) Balıq və çəyirtkə ölüsü; bunlar təmizdir. İbn Ömər ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İki ölü və iki qan bizə halal edildi. Ölü, balıq və çəyirtkə, qan isə ciyər və dalaqdır". Hədisi Əhməd, Şafii, ibn Macə, Beyhəqi və Daraqutni rəvayət etmişdir. Hədis zəifdir. Lakin imam Əhməd hədisin "məuquf" və səhih olduğunu söyləmiş-

---

[1] "əl-Bəqərə" surəsi, 222.
[2] Səhih Muslim, 556.
[3] Nəcasət, ya sidik və qan kimi hissi, ya da cənabət halı kimi mənəvi olur.
[4] Hədis səhihdir. Səhih Əbu Davud, 2858.

dir. Həmçinin Əbu Zura və Əbu Hatim də bu fikirdə olmuşlar. Hədisin bu ləfzlə rəvayət olunması hədisin isnadının Peyğəmbərə ﷺ qədər gedib çatmasına dəlalət edir. Çünki səhabənin: "Filan şey bizə halal edildi, filan şey bizə haram buyuruldu; bizə əmr olundu, bizə qadağan edildi" kimi dediyi sözlər Peyğəmbərdən ﷺ eşitdiyinə işarədir.[1] Dəniz suyu və *dəniz heyvanlarının ölüsü* barəsində Peyğəmbər ﷺ belə buyurmuşdur: "Onun suyu təmiz, ölmüş heyvanları[2] isə halaldır".

b) Axar qanı olmayan qarışqa, arı və başqa bu kimi heyvanların ölüsü; bunlar da təmizdir. Əgər bir şeyin içinə düşüb ölsələr, onu murdar etməzlər. Munziri demişdir: "Şafiidən başqa, yuxarıda adı çəkilənlərin təmiz olması barəsində elm əhli arasında ixtilaf düşməmişdir. Yalnız Şafii məzhəbindəki məşhur rəyə görə bu heyvanların ölüsü murdar sayılır. Bunlar sulu bir şeyin içinə düşüb onu dəyişdirməyincə murdar sayılmazlar".

c) Ölü heyvanın sümüyü, buynuzu, dırnağı, yunu, tükü və dərisi; bunların hamısı təmizdir. Çünki bunların əsli təmizdir və murdar olduğuna dair heç bir dəlil-sübut yoxdur. Zuhri fil və buna bənzər heyvanların sümüyü barədə demişdir: "Mən, bu cür sümüklərdən düzəldilmiş

---

[1] Hədis səhihdir. Səhih ibn Macə, 3314.
[2] Burada yalnız suda yaşayan heyvanlar nəzərdə tutulur.

daraqlarla daranan və onlardan düzəldilmiş qablardan yağlanmaq üçün istifadə edən sələf alimlərinə rast gəldim. Onlar bunda bir qəbahət görmürdülər". Bu əsəri Buxari nəql etmişdir. Rəvayət edilir ki, ibn Abbas ﷻ demişdir: "Peyğəmbər ﷺ Meymunənin kənizinə sədəqə olaraq verilmiş qoyunun öldüyünü görüb dedi: "Nə üçün bu qoyunun dərisini *aşılayıb ondan* istifadə etmirsiniz?" Onlar: "Axı o, murdar olub!"- dedilər. Peyğəmbər ﷺ buyurdu: "Murdar olmuş heyvanın yalnız yeyilməsi haram edilmişdir." Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Ancaq ibn Macə bu hədisi rəvayət etdikdə "Meymunədən"- deyə rəvayət etmişdir. Həmçinin qeyd emək lazımdır ki, Buxari və Nəsainin rəvayətində "aşılanma" kəlməsi zikr olunmamışdır. İbn Abbasdan ﷻ rəvayət edilir ki, o: **"De: "Mənə gələn vəhylər içərisində ölü heyvan, axar qan, murdar sayılan donuz əti və Allahdan başqasının adı ilə kəsilmiş murdar heyvanlardan başqa, hər hansı bir şəxsin yediyi yeməklər içərisində haram buyurulan bir şey görmürəm..."**[1] ayəsini axıra qədər oxuyub demişdir: "Bu ayədə ölü heyvanın yalnız əti haram buyurulmuşdur. Onun dərisi, *dərisindən düzəldilmiş* kəmər, dişi, sümüyü, tükü və yunu isə halal-

---

[1] "əl-Ənam" surəsi, 145.

dır.” Bu əsəri ibn Munzir və ibn Əbu Hatim rəvayət etmişdir. Ölü heyvanın qursağı və südü də təmizdir. Çünki səhabələr İraqı fəth etdikdə məcusilərin düzəltdiyi, içinə maya vurduqları pendirdən yeyirdilər. Halbuki onların kəsdikləri heyvanlar murdar sayılırdı. Salman Farisi ﵁ Mədaində Ömər ibn Xəttabın ﵁ müavini ikən, pendir, yağ və kürk haqqında soruşulduqda belə cavab vermişdir: “Halal, Allahın Öz Kitabında halal buyurduğudur. Haram da, Allahın Öz Kitabında haram buyurduğudur. Hökmünü bildirmədiyi məsələlərdə isə *bizə* sərbəstlik vermişdir”.[1]

**2. Qan.** İstər kəsilən yerdən axan qan olsun, istərsə heyz qanı olsun, o, murdar sayılır. Yalnız az miqdarda gələn qan istisnadır. İbn Cüreyc əl-Ənam, surəsinin 145-ci ayəsindəki “axar qan” kəlməsini “damcılayan” deyə təfsir etmişdir. Damarlarda axan qanda isə heç bir qəbahət yoxdur. Bu rəyi ibn Munzir nəql etmişdir. Əbu Micləzdən, qoyunların kəsildiyi yerə tökülmüş və ya qazanın üstündə qalan qan barəsində soruşduqda, o dedi: “Bunda bir qəbahət yoxdur. Yalnız axar qan haram buyurulmuşdur!” Bu rəyi Abd ibn Humeyd və Əbu Şeyx nəql etmişdir. Aişə ﵂ rəvayət edir ki, biz üzərində qan ləkələri olan qazan-

[1] Məcmu Fətavə, 4/396.

dakı ətdən yeyərdik". Həsən demişdir: "Müsəlmanlar indiyədək yaralı vəziyyətdə olduqda namaz qılırlar". Bu əsəri Buxari "müəlləq" isnadla rəvayət etmişdir.[1] Həmçinin, Ömərin ﵁ yaralı halda, qanı axa-axa namaz qıldığı mötəbər isnadla rəvayət olunmuşdur. Bunu ibn Həcər "Fəthul Bari" əsərində nəql etdikdən sonra demişdir: "Əbu Hureyra ﵁ namazda axan bir və ya iki damcı qanı qəbahət hesab etməzdi".[2] Yuxarıda qeyd olunmuş rəvayətlərdən görünür ki, bitlərin qanı və çibandan axan qan murdar sayılmır. Əbu Micləzdən, bədənə və paltara batan irin barəsində soruşdular. O dedi: "Bunda qəbahət yoxdur. Çünki Allah irin yox, "qan" demişdir". İbn Teymiyyə demişdir: "Paltarı qusuntu və irindən təmizləmək lazımdır". Lakin o, bunların murdar olduğuna dair heç bir dəlil gətirməmişdir. Xülasə budur ki, insan imkan daxilində özünü qorumalıdır.

**3. Donuz əti.** Uca Allah buyurur: **"De: "Mənə gələn vəhylər içərisində ölü heyvan, axar qan, murdar sayılan donuz əti və Allahdan başqasının adı ilə kəsilmiş murdar heyvanlardan başqa, hər hansı bir şəxsin yediyi yeməklər içərisində haram buyurulan bir şey görmürəm..."**[3]

---

[1] Hədis səhihdir. Təmamul Minnə, 1/50.
[2] Hədis zəifdir. Təmamul Minnə 1/51.
[3] "əl-Ənam" surəsi, 145.

Bunlar sağlam insan təbiətinin qəbul etmədiyi murdar şeylərdir. Bu ayədəki bitişən əvəzlik (yəni murdar sözü) onların üçünə də - *həm ölü heyvana, həm axar qana, həm də donuz ətinə* işarədir.

**4, 5, 6. İnsanın qusmağı, sidiyi və nəcisi.** *Alimlər* bu şeylərin murdar olmasında ittifaq etmişlər. Qeyd etmək lazımdır ki, azacıq qusmaq bağışlanılır. Habelə südəmər uşağın sidiyinin hökmü də asanlaşdırılmışdır. Onun təmizlənməsi üçün bulaşdığı yerə su səpmək kifayətdir. Ummu Qeys bint Mihsan رضي الله عنها rəvayət edir ki, o, hələ yemək yeməyən *südəmər* oğlunu Peyğəmbərin ﷺ yanına gətirdi. Peyğəmbər ﷺ körpəni qucağında otuzdurdu və uşaq onun paltarına sidik ifraz etdi. Peyğəmbər ﷺ su gətizdirib ondan paltarının üstünə səpdi və onu yumadı". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Əli ibn Əbu Talib رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Oğlan uşağının sidiyinin üstünə su çilənməli, qız uşağının sidiyi *bulaşdığı yer* isə yuyulmalıdır". Qətadə dedi: "Bu, yemək yeməyən körpələrə aiddir. Elə ki, yemək yeməyə başladılar, hər ikisinin sidiyi yuyulmalıdır". Hədisi Əhməd, Əbu Davud, Tirmizi və Nəsai rəvayət etmişdir.[1] İbn Həcər Fəthul Bari əsərində demişdir: "Hədisin isnadı səhihdir". Körpə süd

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 378.

əmdiyi müddətdə onun *sidiyinin üstünə* su səpmək bəs edir. Yemək yeməyə başladıqda isə artıq onun yuyulması vacib olur. Bəlkə də *oğlan uşağının sidiyi dəydiyi yerə* su səpməyə dair rüsxətin səbəbi, insanların körpələri qucaqda gəzdirməsi və *bu körpələrin* tez-tez onların paltarlarını batırmasıdır. Hər dəfə paltarı yumaq çətin olacaqdı deyə, bu insanlar üçün asanlaşdırıldı.

**7. Vədi.**[1] Bu, sidikdən sonra gələn ağ rəngli qatı mayedir. *Alimlər* onun murdar olduğuna ixtilaf etməmişlər. Aişə رضي الله عنها demişdir: "Vədi sidikdən sonra gələ bilər. Belə olduğu halda yalnız tənasül orqanını yuyub dəstəmaz almaq kifayətdir. Qüsl etməyə lüzum yoxdur". Bu əsəri ibn Munzir rəvayət etmişdir. İbn Abbas رضي الله عنهما demişdir: "Məni, məzi və vədi; məni gəldikdə qüsl etmək, məzi və vədi axdıqda isə *tənasül orqanını* yuyub dəstəmaz almaq lazımdır". Bunu Əsrəm və Beyhəqi rəvayət etmişdir. Beyhəqinin rəvayətində belə deyilir: "Vədi və məzi axdıqda *tənasül orqanını* yu və namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al".

**8. Məzi.**[2] Bu, cinsi əlaqə barədə düşünərkən və ya *zövcə ilə* oynaşarkən çıxan ağ rəngli **y**apışqan mayedir.

---

[1] Orqanizmin patoloji hallarda ifraz etdiyi sperma.

[2] Prostat şirəsi.

Hərdən insan onun axdığını hiss eləmir. Məzi həm kişidən, həm də qadından gəlir, lakin qadından gəlməsi daha çox olur. Məzinin murdar olmasında alimlər həmrəydirlər. Odur ki, bədən məziyə bulaşsa, bulaşdığı yeri yumaq vacibdir. Lakin paltar məziyə bulaşarsa, bulaşdığı yerə su səpmək yetərlidir. Çünki bundan qorunmaq çox çətindir. Subay oğlan və qızların paltarları tez-tez məziyə bulaşır. Odur ki, onun hökmünün südəmər körpə sidiyinin hökmündən yüngül olması daha münasibdir. Əli ibn Əbu Talib ﵁ rəvayət edir ki, məndən tez-tez məzi axırdı. Peyğəmbərin ﷺ qızı mənim həyat yoldaşım olduğuna görə, *utandığımdan başqa* birisini Peyğəmbərin ﷺ yanına göndərdim ki, bunun hökmünü ondan soruşsun. O belə buyurdu: "Dəstəmaz al və cinsi orqanını yu!" Hədisi Buxari və digərləri rəvayət etmişdir. Səhl ibn Hənif rəvayət edir ki, məndən tez-tez məzi gəlirdi. Buna görə də davamlı qüsl edirdim. Mən bunu Peyğəmbərə ﷺ bildirdim. O da belə buyurdu: "Bunun üçün dəstəmaz almaq kifayətdir!" Dedim: "Ey Allahın elçisi! Bəs paltarıma bulaşsa, nə edim?" Peyğəmbər ﷺ buyurdu: "Bir ovuc su götürüb paltarının bulaşdığı yerə səpmək kifayətdir". Hədisi Əbu Davud, ibn Macə və Tirmizi rəvayət etmişdir. Tirmizi hədisin "həsən-səhih" olduğunu demişdir. Hədisin isnadında keçən Mu-

həmməd ibn İshaq "müdəllis"[1] olduğundan etibarsız ravi sayılır. Lakin burada o, rəvayəti kimdən eşitdiyini gizlətməmişdir.[2] Əsrəm bu hədisi başqa ləfz ilə belə rəvayət etmişdir: "Məndən tez-tez məzi gəlirdi. Mən bunu Peyğəmbərə ﷺ bildirdikdə o dedi: "Sənə, bir ovuc su götürüb onun üstünə çiləmək yetər".

**9. Məni.**[3] Bəzi alimlər məninin murdar olduğunu söyləmişlər. Əslində isə məni təmizdir. Lakin yaş olduğu halda onu yumaq, quru olduğu halda onu ovxalamaq müstəhəbdir. Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbərin ﷺ paltarına bulaşmış məni quru olduqda mən onu ovxalayar, yaş olduqda isə onu yuyardım". Hədisi Daraqutni, Bəzzar və Əbu Əvanə rəvayət etmişdir.[4] İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbərdən ﷺ paltara bulaşmış məni barəsində soruşdular. Dedi: "O, tüpürcəyə və burun seliyinə bənzəyir. Onu sadəcə bez parça və ya qamışla sürtmək kifayətdir". Hədisi Daraqutni, Beyhəqi və Təhavi rəvayət etmişdir. *Mühəddislər* bu hədisin Peyğəmbərədək ﷺ istinad olunub-olunmadığında ixtilaf etmişlər.[5]

---

[1] Ön sözə bax.

[2] Hədis həsəndir. Səhih Əbu Davud, 210.

[3] Sperma.

[4] Hədis səhihdir. İrvaul Ğəlil, 1/196

[5] Peyğəmbərə ﷺ istinad edilmiş rəvayət "münkər"dir. Əslində, hədis "məvquf"dur. Yəni ibn Abbasın sözüdür. Silsilətud-Daifə, 2/447.

**10. Əti yeyilməyən heyvanların sidiyi və peyini.** Bunlar murdardır. Abdullah ibn Məsud ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mənə üç daş gətirməyi əmr etdi. Mən iki daş tapdım, üçüncüsünü də axtardım, lakin tapa bilmədim. *Daşın əvəzinə* bir peyin götürüb ona gətirdim. O, daşları götürdü, peyini isə atdı və: "Bu murdardır"- dedi. Hədisi Buxari, ibn Macə və ibn Xuzeymə rəvayət etmişdir. İbn Xuzeymənin rəvayətində: "Bu murdardır, eşşək peyinidir!" ifadəsi əlavə olunmuşdur. Bunlardan qorunmaq çətin olduğundan, azacıq bulanmış yeri təmizləməmək üzürlü sayılır. Vəlid ibn Muslim deyir ki, mən Əvzaidən: "Qatır, uzunqulaq və at kimi əti yeyilməyən[1] heyvanların sidiyi haqqında nə deyə bilərsən?"- deyə soruşdum. O dedi: "Döyüşlərdə səhabələrin bədənləri və ya paltarları buna bulaşırdı. Lakin onlar bunu yumurdular."

Əti yeyilən heyvanların sidiyi və peyininə gəlincə, Malik, Əhməd və bəzi şafiilər bunları təmiz hesab etmişlər. İbn Teymiyyə demişdir: "Səhabələrdən heç biri bunların murdar olduğunu deməmişdir. Əksinə, bu rəy bidətdir

[1] [Qeyd etmək lazımdır ki, at əti yemək halaldır. Cabir ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Xeybər günü bizə ev eşşəyinin ətini yeməyi haram etdi, at ətini yeməyə isə icazə verdi. Hədisi Nəsai və Daraqutni rəvayət etmişdir. Hədis səhihdir. Səhih ən-Nəsai, 4327.]

və səhabələrdən heç biri bu fikirdə olmamışdır”. Ənəs ﷺ rəvayət edir ki, Ukəl və ya Ureyn qəbiləsindən olan bir dəstə *Peyğəmbərin* ﷺ *yanına* gəldi. *Xəstə olduqları üçün* Mədinədə qalmaq istəmədilər. Peyğəmbər ﷺ onlara sağmal dəvələrin olduğu yerə gedib onların sidiyindən və südündən içməyi əmr etdi.” Hədisi Əhməd, Buxari və Muslim rəvayət etmişdir. Bu hədis dəvənin sidiyinin təmiz olduğuna dəlalət edir, habelə əti yeyilən digər heyvanların sidiyi də buna qiyas edilir. İbn Munzir demişdir: “Kim bu hökmün yalnız onlara məxsus olduğunu deyərsə, yanılmış olar. Çünki məxsus olan hökmlər dəlilsiz sübuta yetirilmir”. Yenə ibn Munzir demişdir: “Elm əhlinin, bazarlarda qoyun qığlarını satmaqdan vaz keçməsi və dəvə sidiyini istər qədim zamanda, istərsə də indiki zamanda heç bir şeydən çəkinmədən dərman kimi istifadə etməsi onun təmiz olduğuna dəlalət edir.” Şövkani demişdir: “Məlumdur ki, əslinə görə əti yeyilən hər bir heyvanın sidiyi və peyini təmizdir”. Murdar şeylərin hökmü şəriət tərəfindən müəyyənləşdirilmişdir. Elə buna görə də hər hansı bir şeyin murdar olduğunu iddia edən şəxs Quran və hədislərdən dəlil gətirməlidir. Əti yeyilən heyvanların sidiyinin və peyininin murdar olduğunu deyən alimlərin isə buna dair dəlil gətirdiyini görmürük.

**11. Nəcis yemiş heyvan.** Nəcis yeyən heyvanı minmək, ətini yemək və südünü içmək qadağan edilmişdir. İbn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ nəcis yeyən heyvanın südünü içməyi qadağan etmişdir". Hədisi Əhməd, Əbu Davud, Nəsai və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədisin "səhih" olduğunu demişdir.[1] Başqa rəvayətdə: "nəcis yeyən heyvanı minməyi qadağan etmişdir". Hədisi Əbu Davud rəvayət etmişdir.[2] Amr ibn Şueyb atasından, o da babasından rəvayət etmişdir ki, Peyğəmbər ﷺ ev eşşəyinin ətini, habelə nəcis yeyən heyvanı minməyi və ətini yeməyi qadağan etmişdir". Hədisi Əhməd, Əbu Davud və Nəsai rəvayət etmişdir.[3]

Dəvə, inək, qoyun, toyuq, qaz və digər heyvanlardan nəcis yeyib qoxusu dəyişmiş heyvanlara *ərəbcə* "cəllalə" deyilir. Əgər *bu heyvanlar* bir müddət murdar şeylərdən kənarda saxlanılaraq təmiz yemlə bəslənilsə, əti təmizlənər və "cəllalə" adı onların üstündən götürülər. Çünki bunun qadağan olunmasının səbəbi, onun qoxusunun dəyişməsi idi ki, bu da artıq aradan qaldırıldı.

**12. Sərxoşedici içki.** Alimlərin çoxunun rəyinə görə sərxoşedici içki murdar sayılır. Uca Allah buyurur: **"Ey**

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 3786.
[2] Hədis səhihdir. Səhih Əbu Davud, 2557.
[3] Hədis həsən-səhihdir. Səhih Əbu Davud, 3811.

**iman gətirənlər! Şübhəsiz ki, sərxoşedici *içki* də, qumar da, *tapınmaq məqsədilə* dik qoyulmuş daşlar da, fal oxları da şeytan əməlindən olan murdar şeylərdir. Bunlardan çəkinin ki, bəlkə nicat tapasınız. Həqiqətən, şeytan sərxoşedici *içki* və qumar vasitəsilə sizin aranıza ədavət və kin salmaq, sizi Allahı yad etməkdən və namazdan ayırmaq istəyər. Siz *buna* son qoyacaqsınızmı?"**[1] Bir qism alimlər isə içkinin təmiz olduğunu demiş və ayədə keçən "murdar" kəlməsinin mənəvi murdarlıq olduğunu izah etmişlər. Belə ki, "murdar" kəlməsi, içki ilə yanaşı ayədə keçənlərin hamısına – *qumara, dik qoyulmuş daşlara və fal oxlarına da* aiddir. Bunlar isə maddi cəhətdən murdar sayıla bilməz. Uca Allah buyurur: **"Elə isə murdar bütlərdən uzaq olun..."**[2] Bütlər mənəvi cəhətdən murdar sayılır və onlara toxunanı murdarlamırlar. Ayədə bunların şeytan əməlindən olub insanlar arasına ədavət və kin salacağı, onları Allahı yad etməkdən və namaz qılmaqdan ayıracağı bildirilir ki, bu da onların haram buyurulduğunu bəyan etmək üçündür.

*Sənani* "Subulus-Səlam" kitabında demişdir: "Həqiqət budur ki, əşyaların əsli təmizdir. *Bunlardan birinin* haram buyurulması onun murdar olması demək deyildir. Məsə-

---

[1] "əl-Maidə" surəsi, 90-91.
[2] "əl-Həcc" surəsi, 30.

lən; həşiş *çəkmək* haramdır, lakin onun özü təmizdir. Murdar şeylərə gəldikdə isə, onlar haram buyurulmuşdur. *Qeyd etmək lazımdır ki,* hər bir murdar şey haram sayılır, hər bir haram şey isə murdar sayılmır. Çünki istənilən halda murdar şeyə toxunmaq qadağandır. Demək, bir şeyin murdar olması haram olması deməkdir. Baxın, ipək və qızıl geymək haramdır, lakin hər ikisi həm şəriətə, həm də icmaya görə təmizdir. Bunları bildikdən sonra aydın olur ki, içkinin Quran və hədisdə haram buyurulması, onun murdar olduğuna dəlalət etmir. Əksinə, onun murdar olduğunu sübut etmək üçün başqa bir dəlil gətirmək lazımdır. Əks təqdirdə bu, qəbul edilmiş bir əsasa – *"hər şeyin əsli təmizdir" qaydasına* görə təmiz sayılır. Bunun əksini iddia edən adam dəlil göstərməlidir.

**13. İt.** İt murdardır və onun yaladığı şeyi, birincisini torpaqla yumaq şərtilə yeddi dəfə yumaq lazımdır. Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "İt, sizdən birinizin qabından su içsə, o qabı, birincisini torpaqla yumaq şərtilə yeddi dəfə yumaq lazımdır". Hədisi Əhməd, Muslim, Əbu Davud və Beyhəqi rəvayət etmişdir. Əgər it qabda olan quru yeməyi yalamışsa, onun ağzının dəydiyi yeri və onun ətrafını təmizləyib atmaq, yerdə qalan qidadan əslinin təmiz olduğuna əsasən is-

tifadə etmək olar. İtin tükünə gəlincə, o təmizdir və murdar olduğu sübuta yetirilməmişdir.

## Paltarın və bədənin təmizlənməsi

Paltara və bədənə qan kimi gözə görünən murdar şeylər bulaşdıqda onları nəcasət yox olanadək yumaq lazımdır. Yuyulduqdan sonra üstündə nəcasətin izi qalmışdırsa, bu, üzürlü hesab olunur. *Əgər bu,* sidik kimi gözlə görünməyən nəcasətdirsə, onda onu bir dəfə yumaq kifayətdir. Əsma ﵅ rəvayət edir ki, bir qadın Peyğəmbərin ﷺ yanına gəlib soruşdu: "Bizdən birimizin paltarına heyz qanı bulaşsa, o nə etməlidir?" Peyğəmbər ﷺ buyurdu: "Onu *əli ilə* ovxalasın, sonra suya salıb yaxşıca yusun, sonra üstünə su çiləsin, sonra da onunla namaz qılsın". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Murdar şey qadının paltarının ətəyinə dəysə, torpaq onu təmizləyər. Rəvayət olunur ki, bir qadın Ummu Sələməyə dedi: "Paltarımın ətəyi uzundur və mən onunla murdar yerlərdən keçirəm". Ummu Sələmə dedi: "Peyğəmbər ﷺ demişdir: "Daha sonra sürtüldüyü pak yerlər onu təmizləyir!" Hədisi Əhməd və Əbu Davud rəvayət etmişdir.[1]

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 383.

## Yerin təmizlənməsi

Yerə murdar bir şey bulaşdığı zaman üstünə su tökməklə təmizlənir. Əbu Hureyranın ﵁ rəvayət etdiyi hədis buna dəlildir. O demişdir: "Bir bədəvi gəlib məscidə sidik ifraz etdi. Camaat qalxıb onu tənbeh etmək istədikdə Peyğəmbər ﷺ dedi: "Buraxın onu! Sidiyinin üzərinə də bir qab su tökün. Siz çətinləşdirən deyil, asanlaşdıran olaraq göndərildiniz". Hədisi Əhməd, Buxari, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. *Nəcasətə bulaşmış* yer və yerlə əlaqəsi olan bina və ağac kimi şeylər qurumaqla da təmizlənir. Əbu Qilabə ﵁ demişdir: "Yerin quruması onun təmizlənməsidir", Aişə ﵂ də belə demişdir: "Yer qurumaqla təmizlənir". Hədisi ibn Əbu Şeybə rəvayət etmişdir. Bütün bunlar maye halında olan nəcasətə aiddir. Əgər nəcasət qatı bir şey olarsa, bulaşdığı yeri yalnız nəcasəti yox etməklə və ya onu götürüb başqa yerə atmaqla təmizləmək olar.

## Yağın və buna bənzər şeylərin təmizlənməsi

Meymunə ﵂ rəvayət edir ki, Peyğəmbərdən ﷺ yağın içinə düşmüş siçan barəsində soruşdular. O buyurdu: "Siçanı və onun ətrafındakı yağı atın, yerdə qalanını isə

yeyin!" Hədisi Buxari rəvayət etmişdir. İbn Həcər rəvayət edir ki, ibn Abdulbərr demişdir: "*Alimlər* ittifaq etmişlər ki, qatı bir maddəyə ölü heyvan düşdükdən sonra onun hər tərəfinə yayılmadığı dəqiqləşdirilmişsə, ölmüş heyvan və onun ətrafı atılmalıdır. Maye şəklində olanlara gəldikdə isə, alimlərin əksəriyyətinin fikrincə nəcasət mayenin içinə düşməklə onu tamamilə murdarlayır. Yalnız Zuhri və Əvzaidən başqa.[1]

## Ölmüş heyvan dərisinin təmizlənməsi

Ölmüş heyvanın dərisi aşılandıqda onun həm içi, həm də çölü təmizlənir. İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Dəri aşılanarsa, təmizlənmiş olar!" Hədisi Buxari və Muslim rəvayət etmişdir. [2]

## Güzgünün və buna bənzər əşyaların təmizlənməsi

Güzgü, bıçaq, qılınc, dırnaq, sümük, şüşə, cam və məsaməsi olmayan hər bir hamar şey, ona bulaşmış nəcasə-

[1] Onlar mayenin su hökmündə olduğunu demişlər. Belə ki, mayenin içinə düşmüş nəcasət onun rəngini, yaxud dadını, yaxud da qoxusunu dəyişdirməyincə murdar sayılmaz. Bu, ibn Abbasın رضي الله عنه, ibn Məsudun رضي الله عنه və Buxarinin rəyidir. Bu isə daha doğru rəydir.

[2] Hədisi təkcə Muslim rəvayət etmişdir.

tin silinməsi ilə təmizlənir. Səhabələr qana bulaşmış qılıncları bellərində namaz qılardılar. Onlar qılınclarını silər və bunu yetərli hesab edərdilər.

## Ayaqqabının təmizlənməsi

Nəcasət bulaşmış ayaqqabı və başmaqlar, nəcasətləri silinib gedincəyə qədər torpağa sürtülməklə təmizlənir. Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz nəleyinilə murdar bir şeyi tapdalasa, torpaq onu təmizləyər". Hədisi Əbu Davud rəvayət etmişdir.[1] Digər rəvayətdə isə belə demişdir: "Sizlərdən biri ayaqqabısıyla murdar bir şeyi tapdalasa, torpaq onu təmizləyər".[2] Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sizdən biriniz məscidə gəldiyi zaman ayaqqabılarını çevirib altına baxsın. Murdar bir şey görsə onları yerə sürtüb silsin, sonra da həmin ayaqqabılarda namazını qılsın". Hədisi Əhməd və Əbu Davud rəvayət etmişdir.[3] *Bu rüsxət ona görədir ki,* ayaqqabılar bir çox hallarda nəcasətə bulaşır. Odur ki, ayaqyolunda daşla təmizlənmək *yetərli olduğu* kimi ayaqqabılara bulaşmış nəcasəti də bərk bir şeylə silib təmizləmək yetərlidir, hətta

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 385.
[2] Hədis səhihdir. Səhih Əbu Davud, 386.
[3] Hədis səhihdir. Səhih Əbu Davud, 650.

bu, daha münasibdir. Belə ki, ayaqyolunda arxa və qabaq ifrazat çıxışlarının nəcasətə bulaşması *gündə* iki və ya üç dəfə olduğu halda *ayaqqabıların nəcasətə batmaq ehtimalı ondan daha çoxdur.*

## Lazımi faydalar

**1)** Paltar asılan ipə murdar paltar asılsa, sonra da günəş və ya külək o ipi qurutsa, onun üstünə təmiz paltar asmaq olar.

**2)** Kişi üstünə sıçrayan şeyin su yoxsa sidik olduğunu bilmirsə, onun haqqında soruşması vacib deyil. Soruşduğu adamın, hətta onun murdar olduğunu bilsə belə ona cavab verməsi vacib deyil. Odur ki, həmin adama bu sıçrayan şeyi yumaq vacib deyildir.

**3)** Kişinin gecə vaxtı ayağına və ya balağına yaş bir şey bulaşsa və o, bunun nə olduğunu bilməsə, onu iyləyib nə olduğunu öyrənməsi ona vacib deyildir. Rəvayət edilir ki, bir gün Ömər ﵁ dostu ilə bərabər yol gedərkən navalçadan başlarına su töküldü. Dostu *ev sahibini* səsləyib dedi: "Ey navalça sahibi? Bu su təmizdir, yoxsa murdar?" Ömər ﵁: "Ey navalça sahibi? Bizə heç nə bildirmə!"- dedi və çıxıb getdi.[1]

---

[1] Məcmu Fətavə, 4/386.

**4)** Yollardakı palçığın bulaşdığı yeri yumaq vacib deyildir. Kumeyl ibn Ziyad rəvayət edir ki, mən Əli ibn Əbu Talibin ﵁ yağışdan sonra əmələ gəlmiş palçığa bata-bata gəlib məscidə daxil olduğunu və ayaqlarını yumadan namaz qıldığını gördüm.[1]

**5)** Bir adam namazını qılıb qurtardıqdan sonra paltarında və ya bədənində murdar bir şey olduğunu görsə, – bilməyib, yaxud unudub, yaxud da təmizlənməyə imkan tapmayıb namazını qılmışdırsa, qıldığı namaz səhihdir və onu təkrar qılmağa lüzum yoxdur. Uca Alah buyurur: **"Səhvən etdiyiniz əməllərdə sizə heç bir günah yoxdur"**[2] Səhabələrin və onların ardıcıllarının çoxu belə fətva vermişdir.

**6)** Paltarındakı nəcasətin harada olduğunu bilməyən kəs paltarının hər yerini yumalıdır. Çünki paltarın hər yerini yumadan onun təmiz olduğunu güman etmək mümkün deyildir. Bu isə: "Vacibi tamamlayan bir şeyin özü də vacibdir" qaydasına görə belədir.

**7)** Təmiz paltarlar murdar paltarlara qarışmış olsa, təmizini axtarıb onunla namaz qılmaq lazımdır. Bu, eynilə qiblə məsələsi kimidir. Burada təmiz paltarların çox və ya az olması heç bir əhəmiyyət kəsb etmir.

---

[1] Müsənnəf ibn Əbu Şeybə, 1/177.
[2] "əl-Əhzab" surəsi, 5.

# Ayaqyoluna getməyin ədəbləri

**Ayaqyoluna getməyin ədəbləri aşağıdakılardır:**

**1) İt-bat olacağından, yaxud zay ediləcəyindən qorxmaq istisna olmaqla içində Allahın adı çəkilən şeyləri ayaqyoluna aparmamaq;** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ barmağına, üstündə "Allahın elçisi – Muhəmməd!" yazılmış bir üzük taxar, ayaqyoluna getdikdə isə onu çıxardıb kənara qoyardı". Hədisi Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.[1] İbn Həcər demişdir: "Bu hədisdə "illə" vardır". Əbu Davud demişdir: "Hədis münkərdir. Lakin onun birinci hissəsi (Peyğəmbərin ﷺ üstündə "Allahın elçisi – Muhəmməd!" yazılmış bir üzük taxması) səhihdir".

**2) Ayaqyoluna getdikdə, səsi eşidilməsin və qoxusu ətrafa yayılmasın deyə insanlardan uzaq və qapalı bir yer seçmək;** Cabir ﵁ rəvayət edir ki, Peyğəmbərlə ﷺ birgə səfərə çıxdıq. Peyğəmbər ﷺ gözə görünməyəcəyi məsafəyədək uzaqlaşmayınca ayaqyoluna getməzdi". Hədisi ibn Macə rəvayət etmişdir.[2] Əbu Davudun rəvayətində belə deyilir: "Peyğəmbər ﷺ su başına çıxanda heç kəsin

---

[1] Hədis münkərdir. Daif Əbu Davud, 19.

[2] Hədis səhihdir. Səhih ibn Macə, 335.

görməyəcəyi bir yerə gedərdi".[1] digər rəvayətdə: "Peyğəmbər ﷺ ayaqyoluna getdikdə *gözdən itənədək* uzaqlaşardı".[2]

**3) Bağlı yerlərdə ayaqyoluna getdikdə içəri daxil olarkən və açıq yerlərdə isə paltarın ətəyini qaldırarkən "bəsmələ" və "istiazə"ni oxumaq;** Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna girmək istədikdə belə deyərdi: "Allahın adı ilə! Allahım, pislikdən və pis əməllərdən (erkək və dişi cinlərdən) Sənə sığınıram!"[3] Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.[4]

**4) İstər zikr olsun, istərsə başqa bir şey (kəlmə və ya cümlə) olsun, mütləq olaraq heç bir söz danışmamaq, salamı almamaq və azan verənin dediklərini təkrar etməmək;** yalnız zəruri hallarda danışmaq istisnadır. Buna, yolunu aza biləcək kora yol göstərməyi, yaxud asqırdıqdan sonra dili tərpətmədən "əlhəmdulilləh" deməyi misal çəkmək olar. İbn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyolunda ikən bir kişi onun yanından keçib ona salam

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 2.

[2] Hədis həsən-səhihdir. Səhih Əbu Davud, 1.

[3] Ərəbcəsi:

(( بِسْمِ اللهِ، اللَّهُمَّ إِنِّي أَعُوذُ بِكَ مِنَ الْخُبْثِ وَالْخَبَائِثِ ))

Transkripsiyası: Bismilləh! Allahummə inni əuzu bikə minəl-xubsi vəl-xəbais.

[4] Bu müəlliflər "bismilləh!" kəlməsini rəvayət etməmişlər. Təmamul Minnə, 1/56.

verdi, lakin Peyğəmbər ﷺ onun salamını almadı". Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Əbu Səid ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ayaqyolunda ikən ayıb yerlərini açıb təbii ehtiyaclarını rəf edən iki kişi bir-birilə danışmamalıdırlar. Çünki Allahın buna qəzəbi tutur". Hədisi Əhməd, Əbu Davud və ibn Macə rəvayət etmişdir.[1] Hədisin zahirindən *ayaqyolunda* danışmağın haram olduğu görünür. Lakin alimlər bu hökmü məkruh saymış – yəni *ayaqyolunda* danışmağın bəyənilmədiyini söyləmişlər.

**5) Qibləyə ehtiram göstərmək, dal və ya qabaq tərəfi qibləyə çevirməmək;** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Sizlərdən biri təbii ehtiyaclarını rəf edərkən arxasını və ya qabağını qibləyə çevirməsin!" Hədisi Əhməd və Muslim rəvayət etmişdir. Buradakı qadağa, bu əməlin bəyənilməyən bir əməl olduğunu göstərir. Çünki *başqa bir hədisdə* ibn Ömər ﷺ belə rəvayət etmişdir: "Bir gün mən *bacım* Həfsənin həyət divarının üstünə qalxıb Peyğəmbərin ﷺ üzü Şama və arxası Kəbəyə tərəf oturub təbii ehtiyacını rəf etdiyini gördüm". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

---

[1] Hədis zəifdir. Daif Əbu Davud, 15.

Yaxud bu iki rəvayəti cəm edib demək olar ki, açıq yerdə qibləyə tərəf dönmək qadağan, bağlı yerdə bunu etmək isə caizdir.[1] Mərvan əl-Əsğər rəvayət edir ki, mən ibn Ömərin, dəvəsini qibləyə doğru çökdürüb ona tərəf sidik ifraz etdiyini gördüm. Dedim: "Ey Əbu Abdurrəhman! Məgər belə etmək qadağan olunmayıbmı?" O dedi: "Bəli!... Yalnız açıq yerdə bunu etmək qadağandır. Əgər səninlə qiblə arasında səni örtəcək bir şey vardırsa, onda su başına çıxmaq eyib etməz". Hədisi Əbu Davud, ibn Xuzeymə və Hakim rəvayət etmişdir. "Fəthul Bari" əsərində hədisin isnadının "həsən" olduğu qeyd edilmişdir.[2]

**6) Nəcasətə bulaşmamaq üçün alçaq və yumşaq bir yer seçmək;** Əbu Musa ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ divar dibindəki yumşaq bir yerə gəlib sidik ifraz etdikdən sonra buyurdu: "Sizdən biriniz sidik ifraz etmək üçün münasib bir yer seçsin". Hədisi Əhməd və Əbu Davud rəvayət etmişdir. Hədisin isnadında "məchul" ravi olsa da, mənası səhihdir.[3]

**7) Böcəklərə və digər həşəratlara zərər verməmək üçün yuvalarına sidik ifraz etməmək;** Qətadə Abdullah ibn Sərsəcdən ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ heyvan yu-

---

[1] Bu rəy əvvəlkindən daha doğru hesab edilir.

[2] Hədis həsəndir. Səhih Əbu Davud, 11.

[3] Hədis zəifdir. Daif Əbu Davud, 3.

valarına sidik ifraz etməyi qadağan etmişdir". Qətadədən: "Nə üçün yuvalara sidik ifraz etmək qadağan olundu?"- deyə soruşdular. O: "Çünki yuvalar cinlərin məskənləri-dir"- deyə cavab verdi. Hədisi Əhməd, Nəsai, Əbu Davud, Hakim və Beyhəqi rəvayət etmişdir. İbn Xuzeymə və ibn Səkən hədisin "səhih" olduğunu demişlər.[1]

**8) Ayaqyoluna getdikdə insanların kölkələndikləri yerlərdən, keçdikləri yollardan və *vaxtaşırı* yığışıb söhbət etdikləri yerlərdən çəkinmək;** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurdu: "Lənətə səbəb olan iki şeydən çəkinin!" Səhabələr: "Lənətə səbəb olan iki şey nədir, ey Allahın elçisi?"- deyə soruşdular. O: "İnsanların yollarında və kölgələndikləri yerlərdə təbii ehtiyacları rəf etməkdir"- dedi". Hədisi Əhməd, Muslim və Əbu Davud rəvayət etmişdir.

**9) Qüsl edilən suya, habelə durğun və ya axar sulara sidik ifraz etməmək;** Abdullah ibn Muğəffəl ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sizdən biriniz yuyunduğu suya sidik ifraz edib sonra ondan dəstəmaz almasın. Çünki vəsvəsənin çoxu bundan gəlir". Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.[2] Hədisin "sonra ondan dəstəmaz almasın.." ləf-

---

[1] Hədis zəifdir. Daif Əbu Davud, 29.

[2] Hədisin "sonra ondan dəstəmaz almasın. Çünki vəsvəsənin çoxu bundan gəlir" ləfzindən başqa yerdə qalan hissəsi səhihdir. Səhih Əbu Davud, 27.

zini ancaq Əhməd və Əbu Davud rəvayət etmişdir. Cabir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ durğun suya sidik ifraz etməyi qadağan etmişdir". Hədisi Əhməd, Muslim, Nəsai və ibn Macə rəvayət etmidir. Başqa rəvayətdə belə demişdir: "Peyğəmbər ﷺ axar suya sidik ifraz etməyi qadağan etmişdir". Hədisi Təbərani[1] rəvayət etmişdir və isnadında olanların hamısı etibarlı ravilərdir.[2] Əgər yuyunacaq yer ayaqyolu çanağına bənzər boru vasitəsilə boşaldılırsa, ora sidik ifraz etmək olar.

**10) Ayaq üstə sidik ifraz etməmək;** çünki ayaq üstə sidik ifraz etmək həm insanın mənliyinə, həm də gözəl adətlərə ziddir. Üstəlik belə vəziyyətdə *insanın üstünə* sidik sıçraya bilər. Əgər sidiyin sıçramayacağından əmin olsa, ayaq üstə təbii ehtiyacını rəf edə bilər. Aişə ﵂ belə demişdir: "Kim sizə Peyğəmbərin ﷺ ayaq üstə bövl etdiyini desə, ona inanmayın! Peyğəmbər ﷺ yalnız oturulu halda bövl edərdi". Hədisi Əhməd, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi demişdir: "Bu fəsildə ən gözəl və ən mötəbər dəlil budur".[3] Aişənin ﵂ sözü özünün bildiyinə görə olub, Huzeyfənin ﵁ rəvayətinə zidd deyildir. O rəvayət edir ki, Peyğəmbər ﷺ bir qövmün zi-

[1] Təbərani bunu "Əvsət" əsərində rəvayət etmişdir. Təmamul Minnə, 1/64.
[2] Hədis zəifdir. Daif əl-Cami, 5227.
[3] Hədis səhihdir. Səhih ət-Tirmizi, 12.

bilxanasına gəlib orada ayaq üstə bövl etdi. Mən kənara çəkildim. O mənə: "Su gətir!"- deyə buyurdu. Mən yaxınlaşıb onun arxa tərəfində dayandım. O, dəstəmaz alıb xuflarına[1] məsh etdi. Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Nəvəvi demişdir: "Oturulu vəziyyətdə bövl etmək mənə daha xoşdur və bunu ayaq üstə etmək caizdir. Bunların hamısı Peyğəmbərdən ﷺ varid olmuş hədislərlə sübuta yetirilmişdir".

**11) Ön və arxa ifrazat çıxışlarında olan nəcasəti daş və ya buna bənzər sərt, pak və nəcasəti silməyə uyğun olub haram olmayan şeylə silmək, və ya ancaq su ilə yumaq, ya da hər ikisi ilə[2] təmizləmək vacibdir;** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Sizdən biriniz ayaqyoluna getdikdə üç daşla təmizlənsin. Bunlar ona yetər". Hədisi Əhməd, Nəsai, Əbu Davud və Daraqutni rəvayət etmişdir.[3] Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mən və mənim kimi bir uşaq ona bir cürdək su və ağac parçası aparardıq. O, su ilə təmizlənərdi". Hədisi Buxari və Muslim rəvayət etmişdir. İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ iki qəbrin yanından ke-

---

[1] Dəri ayaqqabı.

[2] Həm daş, həm də su ilə eyni vaxtda təmizlənməyə dair Peyğəmbərdən ﷺ mötəbər bir hədis rəvayət olunmamışdır. Təmamul Minnə, 1/65.

[3] Hədis səhihdir. İrvaul Ğəlil, 1/84.

çərkən belə demişdir: "Bunlar, həqiqətən də, əzab çəkirlər; amma böyük bir şeyə görə əzab çəkmirlər. Biri sidikdən qorunmazdı; digəri isə söz gəzdirərdi". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Ənəsin ﷺ rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sidikdən təmizlənin! Şübhəsiz ki, qəbir əzabının çoxu sidiyə görədir".[1]

**12) Sağ əl murdar şeylərə batmasın deyə sağ əllə təmizlənməmək;** Abdurrəhman ibn Zeyd rəvayət edir ki, Salmana ﷺ dedilər: "Peyğəmbəriniz ﷺ sizə hər şeyi öyrətmişdir. Bəs ayaqyolu ədəblərini necə?" Salman ﷺ dedi: "Bəli, *onu da öyrətmişdir.* Ayaqyolunda qabaq və ya arxa tərəfi qibləyə yönəltməyi, sağ əllə təmizlənməyi, həmçinin üçdən az daşla, yaxud quru peyinlə, yaxud da sümüklə təmizlənməyi bizə qadağan etmişdir". Hədisi Muslim, Əbu Davud və Tirmizi rəvayət etmişdir. Həfsə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ sağ əlini yemək və içmək, libasını geymək, almaq və vermək üçün, sol əlini isə digər işləri görmək üçün istifadə edərdi. Hədisi Əhməd, Əbu Davud, ibn Macə, ibn Hibban, Hakim və Beyhəqi rəvayət etmişdir.[2]

---

[1] Hədisi Bəzzar, Hakim və Daraqutni rəvayət etmişdir. Hədis səhih-liğeyrihidir. Bax: Səhih Tərğib vət-Tərhib, 158.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 32.

**13) Təmizləndikdən sonra əlləri torpağa sürtmək və ya ələ hopmuş xoşagəlməz iyi aparan sabun və buna bənzər şeylərlə yumaq;** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyoluna getdikdə mən mis camda və ya tuluqda ona su aparardım. O, təmizləndikdən sonra əllərini torpağa sürtərdi". Hədisi Əbu Davud, Nəsai, Beyhəqi və ibn Macə rəvayət etmişdir.[1]

**14) Sidik ifraz edib qurtardıqdan sonra, vəsvəsəni dəf etmək üçün övrət yerinə və paltara su çiləmək;** belə etsin ki, sonradan yaş bir şey gördükdə: "Bu mənim səpdiyim sudur"- deyə bilsin. Həkəm ibn Süfyan ﷺ və ya Süfyan ibn Həkəm ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ bövl etdikdən sonra dəstəmaz alar və üstünə su səpərdi". Başqa rəvayətdə belə demişdir: "Mən Peyğəmbərin ﷺ bövl etdikdən sonra övrət yerinə su səpdiyini gördüm".[2] İbn Ömər ﷺ paltarı yaş oluncaya qədər övrət yerinə su səpərdi.[3]

**15) Ayaqyoluna sol ayaqla girib, sağ ayaqla çıxmaq və oradan çıxanda *ərəbcə "Allahım,* məni bağışla" demək;** Aişə ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ ayaqyolundan çıxdıqda deyərdi: "*Allahım,* məni bağışla!"[4] Hədisi Əhməd,

---

[1] Hədis həsəndir. Səhih Əbu Davud, 45.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 160.

[3] Hədis səhihdir. Səhih ən-Nəsai, 134.

[4] Ərəbcəsi: (( غُفْرَانَكَ )) Transkripsiyası: Ğufranəkə.

Əbu Davud, Tirmizi və ibn Macə rəvayət etmişdir.[1] Əbu Hatimin dediyi kimi, bu mövzuda rəvayət edilmiş ən mötəbər hədis, Aişənin ﵂ hədisidir. Zəif isnadla rəvayət olunan başqa hədislərdə Peyğəmbər ﷺ deyərdi: "Əziyyət verən şeyi məndən aparan və məni bağışlayan Allaha həmd olsun!", "*Yeməklərin* ləzzətini mənə daddıran, onun qüvvəsini mənə verən və əziyyətini məndən uzaqlaşdıran Allaha həmd olsun!"[2]

## Fitri sünnələr

Uca Allah peyğəmbərlər üçün bir çox sünnələr seçmiş və bizə də bunlara əməl etməyi əmr etmişdir. Bu sünnələri yerinə yetirənlərin digərlərindən seçilməsi üçün bunları şüar kimi tanınmağa vasitə etmişdir. Bunlar fitri sünnələr adlanır. Bunun izahı isə aşağıdakı kimidir:

**1) Xitan (Sünnət olunmaq);** bu, oğlan uşaqlarının kişilik əzasının ucunu örtən dərinin kəsilməsindən ibarət əməliyyatdır. Bu ona görədir ki, cinsiyyət üzvünün ucuna çirk yığılmasın, sidikdən tam təmizlənmək mümkün olsun və cinsi əlaqənin ləzzəti az olmasın. Bütün bunlar kişilərə aiddir. Qadınlara gəldikdə isə, onun cinsiyyət üzvü-

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 23.
[2] Hədis zəifdir. Daif ibn Macə, 301.

nün üst nahiyəsindən bir az kəsilməsi müstəhəbdir. Bu da qədimdən qalma bir sünnətdir. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "İbrahim səksən yaşında ikən Qəddumla[1] sünnət olunmuşdur." Hədisi Buxari rəvayət etmişdir. Əksər alimlərin rəyinə görə sünnət etmək vacibdir. Şafiilər sünnətin yeddinci gün edilməsini müstəhəb sayırlar. Şovkani isə belə demişdir: "Sünnət etmək üçün nə bir bəlli vaxt müəyyən edilmiş, nə də onun vacib olduğuna dair bir hədis varid olmuşdur".

**2-3) Qasığı qırxmaq və qoltuqaltı tükləri qopartmaq;** hər ikisi sünnədir. Bunları sadəcə qırxmaq, və ya qısaltmaq, ya da qopartmaqla kifayətlənmək olar.

**4-5) Dırnaqları tutmaq və bığları kəsib gödəltmək və ya tamamilə qısaltmaq;** bunların hər birinə dair mötəbər hədislər varid olmuşdur. İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müşriklərə müxalif olun – saqqal buraxın və bığları qısaldın." Hədisi Buxari və Muslim rəvayət etmişdir. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Beş şey fitrətdəndir: qasığı qırxmaq, sünnət etmək, bığları qısaltmaq, qoltuqaltı tükləri qopartmaq və dırnaqları kəsmək". Hədisi Əhməd, Buxari, Mus-

---

[1] Yəni, kərki ilə. Bəzi şərhçilər hədisdə keçən "qəddum" kəlməsinin yer adı olduğunu söyləmişlər. Yəni "İbrahim ﵇ səksən yaşında ikən Qəddum deyilən yerdə sünnət edilmişdir."

lim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. *Bu hədislərdə* bığları kəsib gödəltmək və ya tamamilə qısaltmaq ifadələrindən hər hansı biri təyin edilməmişdir. Hansı birini etsəniz, Sünnəyə əməl etmiş olarsınız. Çünki məqsəd, bığların uzanıb yeməyə və içməyə toxunmaması, onların arasında çirkin qalmamasıdır. Zeyd ibn Ərqam رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Bığlarından almayanlar bizdən deyillər!" Hədisi Əhməd, Nəsai və Tirmizi rəvayət etmişdir.[1] Təmizliyin tamamlanması və canın rahatlanması üçün hər həftə qasığı qırxmaq, qoltuqaltı tükləri qopartmaq, dırnaqları tutmaq, bığları kəsib gödəltmək və ya tamamilə qısaltmaq bəyənilən əməllərdəndir. Çünki bəzi tüklərin bədəndə qalması insana sıxıntı və əziyyət verir. Bununla belə qırx günün tamamınadək bunları təxirə salmağa rüsxət verilmişdir. Lakin qırx gündən artıq saxlamağa heç bir üzr yoxdur. Ənəs رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ bizə bığları qısaltmaq, dırnaqları tutmaq, qoltuqaltı tükləri qopartmaq və qasığı qırxmaq xüsusunda vaxt təyin edib *bunları* qırx gecədən artıq saxlamamağı əmr etmişdir". Hədisi Əhməd, Əbu Davud və başqaları rəvayət etmişdir.[2]

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 2761.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 4200.

**6) Kişidə vüqarlılıq büruzə versin deyə, saqqal buraxmaq;** saqqalı tamamilə kəsib gödəltməmək və ya lap çox uzatmamaq, əksinə, hər şeydə ən gözəl olan orta yolu tutmaq lazımdır. Saqqal saxlamaq kişinin həm əzəmətli, həm də üstün olduğunu göstərir. İbn Ömər ﵄ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Müşriklərə müxalif olun – saqqal buraxın[1] və bığları qısaldın." Hədisi Buxari və Muslim rəvayət etmişdir. Buxarinin "Səhih" əsərində əlavə olaraq rəvayət olunmuşdur ki, ibn Ömər ﵄ həcc və ya ümrə ziyarətində saqqalının bir ovucdan artıq qalan hissəsini alardı".

**7) Saç çoxaldıqda saçları yağlamaq və daramaqla onlara qulluq etmək;** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Qoy saç saxlayan kəs saçına yaxşı baxsın!" Hədisi Əbu Davud rəvayət etmişdir.[2] Əta ibn Yəsar rəvayət edir ki, bir kişi saç-saqqalı dağınıq halda Peyğəmbərin ﷺ yanına gəldi. Peyğəmbər ﷺ əli ilə ona işarə edib saç-saqqalını sahmana salmağı buyurdu. Kişi gedib saç-saqqalını sahmana saldıqdan sonra Peyğəmbərin ﷺ yanına qayıtdı. Peyğəmbər ﷺ dedi: "Məgər bu sizin üçün, birinizin saç-saqqalı dağınıq vəziyyətdə, şeyta-

---

[1] Fəqihlər Peyğəmbərin ﷺ bu əmrinə əsaslanaraq saqqal saxlamağın vacib buyurulduğunu və qırxılmasının haram edildiyini demişlər.

[2] Hədis həsən-səhihdir. Səhih ibn Macə, 4163.

na bənzər şəkildə olmasından daha xeyirli deyilmi?" Hədisi Malik rəvayət etmişdir.[1] Əbu Qətadə رضي الله عنه rəvayət edir ki, onun çiyinlərinə düşən saçları var idi. O, bu haqda Peyğəmbərdən ﷺ soruşduqda o, saçlara yaxşı baxmağı və hər gün onları daramağı Əbu Qətadəyə رضي الله عنه buyurmuşdur." Hədisi Nəsai rəvayət etmişdir. İmam Malik bu hədisi "Muvatta" əsərində belə rəvayət etmişdir: "Mən Peyğəmbərdən ﷺ: "Mənim saçlarım çiynimə düşür; onları darayımmı?"- deyə soruşdum. O buyurdu: "Bəli,... onlara yaxşı bax!" Elə buna görə də Əbu Qətadə رضي الله عنه gün ərzində saçlarını iki dəfə yağlayardı.[2] Başı qırxmaq və ya saç saxlamaq – hər ikisini etmək caizdir. İbn Ömərin رضي الله عنهما rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ belə buyurmuşdur: "Saçlarınızı ya tamamilə qırxın, ya da hamısını saxlayın!" Hədisi Əhməd, Muslim, Əbu Davud və Nəsai rəvayət etmişdir. Başın bir hissəsini qırxıb, qalanını saxlamaq isə qəti şəkildə bəyənilmir. Nafinin ibn Ömərdən rəvayət etdiyi hədis buna dəlildir. İbn Ömər رضي الله عنهما rəvayət etmişdir ki, Peyğəm-

---

[1] Hədisi rəvayət edən Əta ibn Yəsar tanınmış tabiindir, *Peyğəmbəri ﷺ görməmişdir*. Odur ki, hədis mürsəl və zəifdir. Bu hədis başqa bir ləfzlə, bundan da tam şəkildə Cabirdən رضي الله عنه rəvayət edilmişdir. Lakin bu hədisdə saqqal zikr olunmamışdır. Təmamul Minnə, 1/69.

[2] Əbu Qətadədən rəvayət olunan bu hədis, isnadında bağlılıq olmadığına və müxtəlif yollarla bir-birinə zidd olan mətinlərlə rəvayət olunduğuna görə səhih deyildir. Təmamul Minnə, 1/70.

bər ﷺ qəzəəni qadağan etdi." Nafidən: "Qəzəə nədir?"-deyə soruşdular. Dedi: "*Bu,* uşağın başının bir hissəsini qırxıb, qalan hissəsini saxlamaqdır". Hədisi Buxari və Muslim rəvayət etmişdir. İbn Ömərin رضي الله عنهما bundan əvvəlki rəvayəti də buna dəlildir.

**8) Saçlarda və saqqalda olan ağ tükləri olduğu kimi saxlamaq;** bu xüsusda qadın və kişi eynidir. Amr ibn Şu-eyb atasından, o da babasından rəvayət edirlər ki, Pey-ğəmbər ﷺ demişdir: "Ağ tükləri qopartmayın! Çünki on-lar müsəlmanın nurudur. İslam yolunda saç-saqqalı ağar-mış elə bir müsəlman yoxdur ki, bunun sayəsində Allah ona həm savab yazmış, həm dərəcəsini qaldırmış, həm də günahından keçmiş olmasın". Hədisi Əhməd, Əbu Da-vud, Tirmizi, Nəsai və ibn Macə rəvayət etmişdir.[1] Ənəs رضي الله عنه belə demişdir: "Biz, kişinin başındakı və saqqalındakı ağ tükləri qopartmasını yaxşı *əməl* hesab etməzdik". Hədisi Muslim rəvayət etmişdir.

**9) Ağ tükləri xına ilə, habelə qırmızı, sarı və buna bənzər rənglərlə boyamaq;** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Yəhudilər və xristianlar *saçla-rını və saqqallarını* boyamırlar. Siz onlara müxalif olun!" Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tir-

[1] Hədis həsən-səhihdir. Səhih Əbu Davud, 4202.

mizi və ibn Macə rəvayət etmişdir. Əbu Zərr ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Ağ tükləri dəyişdirəcəyiniz ən gözəl şey xına və indiqodur[1]." Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.[2] Saç-saqqalın boyanmasının bəyənilməyən əməllərdən olduğuna dair rəvayətlər də varid olmuşdur.[3] Bundan aydın olur ki, bu hökm yaşın, adət və ənənələrin dəyişmələrinə görə dəyişə bilər. Səhabələrin bəzilərindən rəvayət olunmuş əsərlərdə *saç-saqqalı* boyamağın əfzəl olduğu, digərlərindən rəvayət olunmuş əsərlərdə isə bunu tərk etməyin əfzəl olduğu bildirilir. Bəziləri *saçlarını* sarı rəngə, bəziləri xınaya və indiqoya, bəziləri zəfərana, bəziləri də qara rəngə boyayardı. İbn Həcər "Fəthul Bari" əsərində ibn Şihab əz-Zuhrinin belə dediyini nəql etmişdir: "Biz, üz dərisi bərk olduğu zaman *saç-saqqalı* qara rəngə boyayar, üz və dişlər solduqda isə artıq boyadan istifadə etməzdik."[4] Cabir ﷺ rəvayət edir ki, Məkkənin fəthi günü Əbu Bəkrin ﷺ atası Əbu Quhafəni Peyğəmbərin ﷺ yanına gətirdilər. Onun saçları ağappaq idi. Peyğəmbər ﷺ buyur-

---

[1] İndiqo - tünd sürməyi boyaq və həmin boya hasil edilən tropik bitkidir.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 4205.

[3] Bu iddianı asaslandırmaq üçün heç bir dəlil yoxdur. Təmamul Minnə, 1/74.

[4] Bu rəvayət "mürsəl"dir. Qəribə burasıdır ki, müəllif Cabirin ﷺ səhih hədisinin mənasını inkar etmək üçün bu zəif rəvayətdən istifadə etmişdir. Təmamul Minnə, 1/84.

du: “Bunu zövcələrindən birinin yanına aparın, bir şeylə onun saçlarının rəngini dəyişsin. Yalnız qara rəngdən çəkinin!” Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir. Bu hökm müəyyən bir adama aid olub hamıya şamil edilə bilməz. Belə ki, Əbu Quhafə kimi saçları ağarmış bir adama *öz saçlarını* qara rəngə boyaması yaxşı düşməzdi. O yaşda olan adama saçlarını qaraltmaq yaraşmaz. *Odur ki, qara rəngdən istifadə etmək qadağan edildi.*

**10) Ətir sürtmək;** nəfsi rahatlayan, ürək açan, adamı ruhlandıran, bədənə güc və qüvvət verən ətirlərdən istifadə etmək sünnədir. Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Dünyada mənə qadınlar və *gözəl* ətir sevdirildi; namaz isə gözlərimin işığıdır.” Hədisi Əhməd və Nəsai rəvayət etmişdir.[1] Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: “Kimə gözəl ətir təklif olunsa, ondan imtina etməsin. Çünki daşınacaq ən xəfif yük, gözəl qoxudur”. Hədisi Muslim, Nəsai və Əbu Davud rəvayət etmişdir. Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ətir haqqında belə demişdir: “O, qoxuların ən gözəlidir”. Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai və Tirmizi rəvayət etmişdir. Nafi rəvayət edir ki, ibn Ömər ﵄ tərkibində başqa bir ətir olmayan “Ud” və tərkibinə

[1] Hədis səhihdir. Səhih ən-Nəsai, 3939.

başqa bir ətir qarışdırılmış kafurla ətirlənib deyərdi: "Peyğəmbər ﷺ də belə ətirlənərdi". Hədisi Muslim və Nəsai rəvayət etmişdir.

## Dəstəmaz

Dəstəmaz üz, əllər, baş və ayaqlarla əlaqəli, su ilə yerinə yetirilən təmizlikdir. Dəstəmaza aid məsələlər bunlardır:

**1) Dəstəmazın şəriət qanunu olduğuna dair dəlillər;**

Dəstəmazın şəriətə aid olduğu üç növ dəlillə sübuta yetirilmişdir:

**Birinci dəlil** - Qurani Kərimdir. Uca Allah buyurur: **"Ey iman gətirənlər! Namaza durarkən üzünüzü və dirsəklərə qədər əllərinizi yuyun, başınıza məsh çəkin və topuqlara qədər ayaqlarınızı *yuyun*".**[1]

**İkinci dəlil** – Sünnədir. Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizlərdən biri təbii ehtiyacını rəf etdikdən sonra dəstəmaz almayınca Allah onun namazını qəbul etməz!" Hədisi Buxari, Muslim, Əby Davud və Tirmizi rəvayət etmişdir.

---

[1] "əl-Maidə" surəsi, 6.

**Üçüncü dəlil** - İcmadır. Peyğəmbərin ﷺ zamanından indiyədək cəmi müsəlmanlar, dəstəmazın vacib olduğunda ittifaq etmişlər. Bu ittifaq, dində məlum olan zəruri hökmlərdən olmuşdur.

**2) Dəstəmazın fəziləti;**

Dəstəmazın fəzilətinə dair bir çox hədislər varid olmuşdur. Bunlardan bəzilərinə işarə etməklə kifayətlənəcəyik:

**a)** Abdullah əs-Sənabihi رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “*Müsəlman* bəndə dəstəmaz alıb ağzını su ilə yaxaladığı zaman günahları onun ağzından çıxar. Burnunun içini su ilə yuduğu zaman günahları burnundan çıxar. Üzünü yuduğu zaman günahları onun üzündən, hətta göz qapaqlarının ucundan belə tökülər. Əllərini yuduğu zaman günahları onun əllərindən, hətta əl dırnaqlarının altından belə çıxar. Başına məsh etdiyi zaman günahları onun başından, hətta qulaqlarından belə çıxar. Ayaqlarını yuduğu zaman günahları onun ayaqlarından, hətta ayaq dırnaqlarının altından belə çıxar. Sonra məscidə getməsi və namaz qılması *onun günahlarının yuyulması üçün* əlavə kəffarə olar”. Hədisi Malik, Nəsai, ibn Macə və Hakim rəvayət etmişdir.[1]

[1] Hədis səhih-liğeyrihidir. Səhih Tərğib, vət-Tərhib, 185.

**b)** Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Kişidə olan gözəl bir xislət sayəsində Allah onun bütün əməllərini düzəldər. Kişinin namaz üçün təmizlənməsi səbəbilə Allah onun günahlarından keçər. *Beləliklə,* namaz qılması *onun günahlarının yuyulması üçün* əlavə kəffarə olar". Hədisi Əbu Yələ, Bəzzar və Təbərani "Əvsət" əsərində rəvayət etmişdir.[1]

**c)** Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizə elə bir şey göstərimmi ki, Allah onun sayəsində günahları silsin və dərəcələri yüksəltsin?" Səhabələr: "Bəli, ya Rəsulallah!"- deyə cavab verdilər. O buyurdu: "Çətinliklərə baxmadan dəstəmazı tam şəkildə almaq, uzaq yerlərdən məscidə gəlmək və namaz qıldıqdan sonra növbəti namazı gözləmək. Keşik çəkmək də budur![2] Keşik çəkmək də budur! Keşik çəkmək də budur!" Hədisi Malik, Muslim, Tirmizi və Nəsai rəvayət etmişdir.

**d)** Yenə Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ qəbiristanlığa gəlib dedi: "Ey *bu* diyarın möminləri! Sizə salam olsun! Biz də yaxın zamanda Allah qoysa sizə qovuşacağıq; Mən qardaşlarımızı görmək istəyirəm." *Səhabələr* dedilər: "Məgər biz sənin qardaşların deyilik, ya Rəsulallah?" Peyğəmbər ﷺ dedi: "Siz mənim səhabələrimsi-

---

[1] Hədis münkərdir. Təmamul Minnə, 1/87.

[2] Yəni təmizliyə və ibadətə riayət etmək Allah yolunda olan cihada bərabərdir.

niz. Qardaşlarımız isə hələ gəlməmiş kimsələrdir". *Səhabələr* dedilər: "Ümmətindən hələ gəlməmiş kimsələri nədən tanıyırsan, ya Rəsulallah?" Peyğəmbər ﷺ dedi: "Bir adamın qara rəngli atları arasında üç ayağında ağ ləkə olan qaşqa[1] atı olsa, onu tanımazmı?" Səhabələr: "Bəli, ya Rəsulallah!"- deyə cavab verdilər. Peyğəmbər ﷺ dedi: "Qardaşlarımız üzləri, habelə əlləri və ayaqları dəstəmaz nuru ilə parlaq olaraq gələcəklər, mən də onlardan öncə gedib hovuz başında onları gözləyəcəyəm. Bilin və agah olun ki, bəzi adamlar hovuzun başından dəvənin qovulduğu kimi qovulacaqlar. Mən onları səsləyib deyəcəyəm: "Haydı, gəlin yanıma!" *Onda* mənə belə deyiləcək: "Səndən sonra onlar yollarını dəyişdirdilər". Mən də: "Rədd olsun onlar! Rədd olsun onlar!"- deyəcəyəm." Hədisi Muslim rəvayət etmişdir.

### 3) Dəstəmazın vacibləri;

Dəstəmazın bir çox vacibləri və ərkanları vardır ki, bunlardan biri yerinə yetirilmədikdə dəstəmaz şəriətə görə düzgün sayılmır. Dəstəmazın vacibləri aşağıdakılardır:

**1) Niyyət etmək;** niyyətin gerçəkliyi, Allahın rizasını qazanmaq və Onun buyuruğunu yerinə yetirmək məqsə-

---

[1] Qaşqa: mal-qaranın, xüsusilə at, inək və öküz kimi iri ev heyvanlarının alnındakı ağ ləkədir.

dilə iradəni görülən işə yönəltməkdir. Niyyət sırf qəlbə aid olub dilin ona heç bir dəxli yoxdur. Niyyəti dillə demək şəriət baxımından düzgün sayılmır. Niyyətin vacib olduğuna dəlil isə Ömər ibn Xəttabın ﷺ rəvayət etdiyi hədisdir. *Bu hədisdə* Peyğəmbər ﷺ buyurmuşdur: "Əməllər ancaq niyyətlərə görədir. Hər kəsə də yalnız niyyət etdiyi şey qalacaqdır..." Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

**2) Üzü bir dəfə yumaq;** yəni üzə su tökməkdir. Üzün həddi – uzununa alının üstündən çənənin altına kimi, eninə isə bir qulağın mərcəyindən[1] o biri qulağın mərcəyinə kimidir.

**3) Əlləri dirsəklərə qədər yumaq;** dirsək, bazu ilə bilək arasında olan buğumdur. *Dəstəmaz əsnasında* onların da yuyulması vacibdir. Peyğəmbərin ﷺ tutduğu yol budur. Onun dirsəkləri yumağı tərk etdiyinə dair heç bir hədis varid olmamışdır.

**4) Başa məsh çəkmək;** məsh, yaş əlləri *başa* sürtməkdir. Bu da məsh edən kimsənin yaş əllərini məsh edilən yerə toxunduraraq hərəkət etdirməsindən başqa heç cür yerinə yetirilə bilməz. Əli və ya barmağı başa və ya başqa bir yerə qoymaq məsh adlanmır.

---

[1] Mərcək: qulağın aşağı ətli hissəsidir.

Uca Allahın: “başınıza məsh çəkin”[1] ayəsinin zahiri mənası başın hər tərəfinə məsh etməyin vacib olduğuna dəlalət etmir. Əksinə, bundan belə başa düşülür ki, başın bir hissəsinə məsh çəkmək əmri yerinə yetirmək üçün kifayətdir. Peyğəmbərdən ﷺ bu xüsusda üç növ rəvayət varid olmuşdur:

**a) Başın hər tərəfini məsh etmək;** Abdullah ibn Zeyd ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ əllərini irəli-geri aparıb gətirməklə başına məsh çəkdi – əllərini başının ön tərəfindən qafasına qədər apardı, sonra da başladığı yerə qaytardı...” Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

**b) Təkcə əmmaməyə məsh etmək;** Amr ibn Umeyyə ﵁ rəvayət edir ki, mən Peyğəmbəri ﷺ əmmaməsinin və xuflarının[2] üstünə məsh edərkən gördüm”. Hədisi Əhməd, Buxari və ibn Macə rəvayət etmişdir. Bilal ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “Xufların və baş örtüyünün üstünə məsh çəkin!” Hədisi Əhməd rəvayət etmişdir.[3] Ömər ibn Xəttab ﵁ demişdir: “Əmmaməyə məsh çəkməklə məshin keçərli olduğunu qəbul etməyən kimsə-

[1] “əl-Maidə” surəsi, 6.

[2] Dəri ayaqqabı.

[3] Hədisi Əhməd rəvayət etmişdir. Hədis zəifdir. Silsilətul Əhadis əd-Daifə, 6/489; 2935-ci hədis.

ni Allah təmizləməsin". Bu xüsusda Buxari, Muslim və digər imamların rəvayət etdiyi bir çox hədislər vardır. Həm də bir çox elm əhli buna əməl etmişdir.

**c) Əmmaməyə və kəkilə məsh etmək;** Muğirə ibn Şöbə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ dəstəmaz aldıqda kəkilinə, əmmaməyə və xuflara məsh çəkdi." Hədisi Muslim rəvayət etmişdir. Peyğəmbərdən ﷺ varid olan rəvayət budur. Ayənin zahiri mənasından başın bir hissəsinə məsh çəkməyin yetərli olduğu başa düşülsə də, bu xüsusda Peyğəmbərdən ﷺ heç bir hədis rəvayət edilməmişdir. Demək, təkcə hörüklər kimi kənara çıxan saçlara məsh çəkmək kifayət deyildir.

**5) Ayaqları topuqlara qədər yumaq;** Peyğəmbərin ﷺ *ümmətinə* buyurduğuna, üstəlik özünün də belə etdiyinə dair rəvayətlər mütəvatir olaraq varid olmuşdur. Abdullah ibn Amr رضي الله عنهما rəvayət edir ki, səfərdə olduğumuz zaman Peyğəmbər ﷺ bizdən geri qaldı, sonra da namazın vaxtının çıxmağına az qalmış gəlib bizə çatdı. *Namazın vaxtı çıxacaqdı deyə* biz dəstəmaz alıb ayaqlarımıza məsh etməyə başladıq. Peyğəmbər ﷺ *bunu görcək* uca səslə iki və ya üç dəfə belə buyurdu: "Atəşə girən dabanların vay ha-

lına!”[1] Hədisi Buxari və Muslim rəvayət etmişdir. Abdurrəhman ibn Əbu Leyla belə demişdir: “Peyğəmbərin ﷺ səhabələri topuqların yuyunması xüsusunda ittifaq etmişlər”. Yuxarıda sadaladığımız vaciblərə dəlil Uca Allahın bu ayəsidir: **“Ey iman gətirənlər! Namaza durarkən üzünüzü və dirsəklərə qədər əllərinizi yuyun, başınıza məsh çəkin və topuqlara qədər ayaqlarınızı *yuyun*”.**[2]

**6) Bunları ardıcıl şəkildə etmək;** çünki Uca Allah bu ayədə dəstəmazın vaciblərini ardıcıl olaraq zikr edib yuyulması vacib olan əllərin və ayaqların arasında, başı məsh etməyi buyurmuşdur. Ərəb qrammatikasında cümlənin həmcins üzvləri yalnız fayda üçün bir-birindən ayrılır. Burada olan fayda isə ardıcıllığın əhəmiyyətidir. Ayənin bu şəkildə gətirilməsi ardıcıllığın vacib olmasını göstərir. Həmçinin Peyğəmbərin ﷺ ümumi olaraq: “Allahın başladığı ilə başlayın!”[3]- deyə söylədiyi hədisi buna dəlildir. Bu

---

[1] [Səhabələr ayaqlarını tələm-tələsik yuduqlarına görə onların topuqlarına su dəyməmişdir. Odur ki, Peyğəmbər ﷺ onlara, “Atəşə girən dabanların vay halına!” demişdir. Bunu Muslimin rəvəyət etdiyi digər hədis daha aydın şəkildə göstərir. Abdullah ibn Amr ؓ demişdir: “Biz Peyğəmbərlə ﷺ birlikdə Məkkədən Mədinəyə qayıdırdıq. Nəhayət, gəlib yol üstündəki su başına yetişdik. Əsr çağında camaat tələsdi və tələsə-tələsə dəstəmaz aldı. (Nəhayət,) biz onlara yetişdik. Onların dabanlarına su dəymədiyi (apaydın) görünürdü. (Bunu görəndə) Peyğəmbər ﷺ buyurdu: “Oda girəcək dabanların vay halına! Elə isə dəstəmazı tam şəkildə alın!”]

[2] “əl-Maidə” surəsi, 6.

[3] Hədis *əmr formasında gələn* “başlayın” ləfzi ilə şəzdir. Səhih odur ki, hədisdə keçən “başlayın” sözü əmr formasında yox, “başlayıram” ləfzi ilə xəbər formasında varid olmuşdur. Təmamul Minnə, 1/88.

sünnənin tətbiqi daim belə olmuşdur. Peyğəmbərdən ﷺ elə bir hədis varid olmamışdır ki, onun, dəstəmaz aldıqda ardıcıllığı pozduğunu bildirsin.[1] Dəstəmaz ibadətdir. İbadətdə məqsəd isə tabe olmaqdır. Peyğəmbərin ﷺ necə dəstəmaz aldığı bəlli olduqdan sonra heç kəsin ona müxalif olmağa haqqı yoxdur.

**4) Dəstəmazın sünnələri;**

Peyğəmbərin ﷺ vacib buyurmadığı və tərk olunduqda qınamadığı söz və ya əməl *sünnə sayılır.*

Dəstəmazın sünnələri bunlardır:

**1) Dəstəmaza başladıqda "bismilləh" demək;** "bismilləh"ə dair varid olmuş hədislərin hamısı zəifdir. Lakin bu hədislərin hamısı bir yerdə, dəstəmazda "bismilləh" deməyin əsaslı olduğunu göstərir. Əslinə qalsa, "bismilləh" demək gözəl əməldir. Ümumiyyətlə şəriətə uyğundur.

**2) Misvakdan istifadə etmək;** misvak dişlərin təmizlənməsi üçün istifadə edilən, Ərak ağacından və buna bənzər ağaclardan düzəldilmiş təbii diş fırçasıdır. Ən xeyirlisi də Hicazda yetişən Ərak ağacından düzəldilən misvaklardır. Misvak damağı bərkidir, dişlərdə olan xəstəlikləri ara-

[1] Əksinə, Əhməd və Əbu Davudun əl-Miqdam ibn Mədi Kərbidən rəvayət etdiyi hədisdə Peyğəmbərin ﷺ ardıcıllığa riayət etmədən dəstəmaz aldığı rəvayət olunmuşdur. Şovkani bu hədisin isnadının mötəbər olduğnu demişdir. Təmamul Minnə 1/88.

dan qaldırır, həzmi yüngülləşdirir, dişlərdəki saraltını aparır və ağızdakı qoxunu dəyişir. Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəbər ﷺ demişdir: "Ümmətimə əziyyət olmasaydı, hər dəstəmazda misvakdan istifadə etməyi onlara əmr edərdim". Hədisi Malik, Şafii, Beyhəqi və Hakim rəvayət etmişdir.[1] Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəbər ﷺ demişdir: "Misvak ağzı təmizləmək *və* Rəbbin rizasını qazanmaq üçündür". Hədisi Əhməd, Nəsai və Tirmizi rəvayət etmişdir.[2]

İstənilən vaxt misvakdan istfadə emək bəyənilən əməllərdəndir. Lakin beş vaxt vardır ki, bu vaxtlarda ondan istifadə etmək daha yaxşıdır:

a) Dəstəmaz əsnasında;

b) Namaza başladıqda;

c) Quran oxunacağı zaman;

d) Yuxudan oyandıqda;

e) Ağız qoxusu dəyişdikdə;

Oruc tutanın və ya tutmayan kimsənin istər gündüzün əvvəlində, istərsə də axırında misvakdan istifadə etməsinin heç bir fərqi yoxdur. Amir ibn Rəbiyə رضي الله عنه rəvayət edir ki, mən Peyğəmbərin ﷺ oruclu olduğu halda misvakdan istifadə etdiyini lap çox gördüm. Hədisi Əhməd, Əbu

---

[1] Hədis səhihdir. Səhih əl-Cami, 5317.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 5.

Davud və Tirmizi rəvayət etmişdir.[1] Misvak təmiz qalsın deyə istifadə etdikdə onu yumaq sünnədir. Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ misvakdan istifadə etmək istədikdə yumaq üçün onu mənə verərdi. Mən onu təmizlədikdən sonra yuyub Peyğəmbərə ﷺ verərdim. Hədisi Əbu Davud və Beyhəqi rəvayət etmişdir.[2] Dişləri olmayan kimsənin, barmaqlarıyla damağını təmizləməsi sünnədir. Aişədən ﵂ rəvayət edilir ki, o, *Peyğəmbərdən* ﷺ: "Ey Allahın Elçisi! Dişləri olmayan kəs misvakdan istifadə edirmi?"- deyə soruşdu. O: "Bəli!"- dedi. Aişə: "*O bunu* necə edir?"- deyə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Barmağını ağzına soxur". Hədisi Təbərani rəvayət etmişdir.[3]

**3) Dəstəmazın əvvəlində əlləri üç dəfə yumaq;** Ovs ibn Ovs əs-Səqəfi ﵁ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ, dəstəmaz alarkən əllərini biləyədək üç dəfə yuduğunu gördüm. Hədisi Əhməd və Nəsai rəvayət etmişdir.[4] Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Sizdən biriniz yuxudan oyandıqda əllərini üç dəfə yumayınca, onları qabın içinə salmasın. Çünki o, əllərinin haralara dəydini bilmir". Hədisi Əhməd, Buxari, Muslim,

---

[1] Hədis zəifdir. Daif Əbu Davud, 2364.
[2] Hədis həsəndir. Səhih Əbu Davud, 52.
[3] Hədis münkərdir. Təmamul Minnə, 1/90.
[4] İsnadı səhihdir. Səhih Nəsai, 83.

Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Lakin Buxari bunun sayını bildirməmişdir.

**4) Üç dəfə ağızı su ilə yaxalamaq** ***(ərəbcə buna "mədmədə" deyilir);*** Ləqit ibn Səbirə رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Dəstəmaz aldıqda ağzını yaxala!" Hədisi Əbu Davud və Beyhəqi rəvayət etmişdir.[1]

**5) Üç dəfə buruna su çəkib onu yumaq** ***(ərəbcə buna "istinşaq" və "istinsar" deyilir);*** Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz dəstəmaz aldıqda burnuna su çəkib onu yusun!" Hədisi Buxari, Muslim və Əbu Davud rəvayət etmişdir. Suyu sağ əllə götürüb buruna çəkmək və sol əllə onu təmizləmək sünnədir. Əli ibn Əbu Talibdən ﷺ rəvayət olunur ki, o, su gətizdirib ağzını yaxaladı, burnuna su aldı və sol əli ilə burnunun içindəki suyu təmizlədi. O bunu üç dəfə etdikdən sonra dedi: "Peyğəmbər ﷺ də belə dəstəmaz alardı". Hədisi Əhməd və Nəsai rəvayət etmişdir.[2] İstənilən şəkildə ağıza və buruna *ayrı-ayrılıqda və ya bir yerdə* suyun alınması "mədmədə" və "istinşaq" hesab olunur. Lakin bunun ən dəqiq forması belədir ki, Peyğəmbər ﷺ bunu bir yerdə edərdi. Abdullah ibn Zeyd رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ ağzını və burnunu üç ovuc su ilə yudu. Hədisi Buxari və

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 132.
[2] Hədis səhihdir. Səhih ən-Nəsai, 91.

Muslim rəvayət etmişdir. Oruclu olmayan kimsənin ağzına və burnuna su alarkən mübaliğə etməsi – suyu bir ovucdan artıq götürməsi sünnədir. Ləqit ﷺ rəvayət edir ki, mən *Peyğəmbərə* ﷺ: "Ey Allahın Elçisi! Mənə dəstəmaz haqqında xəbər ver"- dedim. Peyğəmbər ﷺ buyurdu: "Dəstəmazı tam şəkildə al, barmaqlarının arasını yu, oruclu olmadığın zaman burnuna aldığın suyu çox al". Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi bu hədisin səhih olduğunu demişdir.[1]

**6) Saqqalın arasına su keçirmək;** Osman ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ *dəstəmaz aldıqda* saqqalının arasına su keçirərdi. Hədisi ibn Macə[2] və Tirmizi rəvayət etmişdir. Tirmizi hədisin səhih olduğunu demişdir. Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ dəstəmaz aldıqda bir ovuc su götürüb onu çənəsinin altından saqqalının arasına keçirdi və dedi: "Qüdrətli və qüvvətli Rəbbim mənə belə etməyi buyurdu!" Hədisi Əbu Davud, Beyhəqi və Hakim rəvayət etmişdir.[3]

**7) Barmaqların arasını yumaq;** ibn Abbas ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurdu: "Dəstəmaz aldıq-

---

[1] Hədis səhihdir. Səhih ibn Macə, 407.
[2] Hədis səhihdir. Səhih ibn Macə, 430.
[3] Hədis səhihdir. Səhih Əbu Davud, 15.

da əl və ayaq barmaqlarının arasını yu!" Hədisi Əhməd, Tirmizi və ibn Macə rəvayə etmişdir.[1] Müstəvrid ibn Şəddad ﷺ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ, çeçələ barmağı ilə ayaq barmaqlarının arasını yuduğunu gördüm. Hədisi Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.[2] Üzük, bilərzik və bunlara bənzər şeylərin *dəstəmaz əsnasında* hərəkət etdirilməsi barədə hədislər varid olmuşdur. Lakin bu hədislər səhih dərəcəsinə çatmamışdır. Dəstəmazın tam alınması üçün bunu etmək məqsədə uyğun olar.

**8) Dəstəmaz əzalarını üç dəfə yumaq;** çox vaxt Peyğəmbər ﷺ belə edərdi. Lakin hərdən *üç dəfədən* az yumağın çaiz olduğunu bəyan etmək üçün dəstəmaz əzalarının hər birini bir və ya iki dəfə yuyardı. Amr ibn Şueyb atasından, o da babasından rəvayət edir ki, bədəvi *ərəb* Peyğəmbərin ﷺ yanına gəlib ondan dəstəmaz haqqında soruşdu. Peyğəmbər ﷺ *dəstəmaz əzalarını* üç dəfə, üç dəfə yuyub *bunu ona* göstərdikdən sonra buyurdu: "Budur dəstəmaz! Kim buna əlavə etsə, pis bir iş tutmuş, həddi aşmış və zülm etmiş olar". Hədisi Əhməd, Nəsai və ibn Macə rəvayət etmişdir.[3] Osman ﷺ rəvayət edir ki, "Peyğəmbər ﷺ

---

[1] Hədis səhihdir. Silsilətul Əhadis əs-Səhihə, 1306.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 135.

[3] Hədis səhihdir. Silsilətul Əhadis əs-Səhihə, 2980.

dəstəmaz aldıqda *əzalarını* üç dəfə, üç dəfə yudu." Hədisi Əhməd, Muslim və Tirmizi rəvayət etmişdir. Həmçinin Peyğəmbər ﷺ dəstəmaz aldıqda əzalarını iki dəfə, iki dəfə və bir dəfə, bir dəfə yuduğu səhih hədislərdə varid olmuşdur. Başa məsh çəkməyə gəldikdə isə, əksər rəvayətlərə görə o bunu bircə dəfə etmişdir.

**9) Sağdan başlamaq;** yəni əlləri və ayaqları yuduqda soldan əvvəl sağı yumaq. Aişə رضي الله عنها belə demişdir: "Peyğəmbər ﷺ ayaqqabılarını geyindikdə, saçını daradıqda, yuyunduqda və bütün işlərində sağdan başlamağı sevərdi". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Libas geyindiyiniz və dəstəmaz aldığınız zaman sağdan başlayın!" Hədisi Əhməd, Əbu Davud, Tirmizi və Nəsai rəvayət etmişdir.[1]

**10) Sürtmə;** bu, yaş əlləri əzalara sürtməkdir. Abdullah ibn Zeyd رضي الله عنه rəvayət edir ki, "Peyğəmbərə ﷺ muddun üçdə ikisi qədər su gətirdilər. O, dəstəmaz alıb *yaş əlini* qollarına sürtməyə başladı". Hədisi ibn Xuzeymə rəvayət etmişdir.[2] Digər rəvayətdə demişdir: "Peyğəmbər ﷺ dəstəmaz alıb: "beləcə sürtün"- dedi". Hədisi Əbu Davud ət-Təyalisi, Əhməd, ibn Hibban və Əbu Yələ rəvayət etmişdir.

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 4141.
[2] Hədis səhihdir. Təmamul Minnə, 1/91.

**11) *Əzaları* aramsız yumaq;** yəni bir əzanın suyu qurumadan digərini yumaq. Dəstəmaz alan adam dəstəmaz əsnasında başqa bir işlə məşğul olmamalıdır. Əvvəlki və sonrakı müsəlmanların tutub getdiyi sünnə də budur.

**12) Qulaqlara məsh çəkmək;** Qulaqlar başa aid olduğu üçün başın suyundan, şəhadət barmağıyla qulağın içinə və baş barmaqla da çölünə məsh etmək sünnədir. Miqdam ibn Mədi Kərbi ﷺ rəvayət edir ki, "Peyğəmbər ﷺ dəstəmaz aldıqda başına və qulaqlarının çölünə və içinə məsh çəkdi, barmaqlarını qulaqlarının içinə saldı." Hədisi Əbu Davud və Təhavi rəvayət etmişdir.[1] İbn Abbas ﷺ Peyğəmbərin ﷺ necə dəstəmaz aldığını rəvayət edib demişdir: "*Peyğəmbər* ﷺ başına və qulaqlarına bir dəfə məsh etdi". Hədisi Əhməd və Əbu Davud rəvayət etmişdir.[2] Digər rəvayətdə demişdir: "Peyğəmbər ﷺ başına və qulaqlarına məsh etdi. Şəhadət barmaqlarıyla qulaqlarının içinə və baş barmaqlarıyla qulaqlarının çölünə məsh çəkdi".[3]

**13) Dəstəmaz əzalarının parlaqlığını və nurunu artırmaq;** Üzün parlaqlığını artırmaq üçün onun hər yerini yaxşı-yaxşı yumaq lazımdır. O ki qaldı əllərin və ayaqların nurunu artırmağa, bunun üçün qolları dirsəklərdən,

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 121.
[2] Hədis lap zəifdir. Daif Əbu Davud, 133.
[3] [Hədisi Nəsai rəvayət etmişdir. Hədis səhihdir. Mişkatul Məsabih, 1/89.]

ayaqları isə topuqlardan bir az yuxarıya qədər yumaq gərəkdir. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətim Qiyamət günü üzləri parlaq, əlləri və ayaqları nurlu olduğu halda gələcəklər." Əbu Hureyra ﵁ dedi: "Aranızdan kim üzünün parlaqlığını artıra bilirsə, qoy artırsın!" Hədisi Əhməd, Buxari və Muslim rəvayət etmişdir. Əbu Zura rəvayət edir ki, Əbu Hureyra ﵁ su gətizdirib dəstəmaz aldı. O, *dəstəmaz əsnasında* qollarını dirsəkdən yuxarıya kimi, ayaqlarını da topuqlarından yuxarıya kimi yudu". Mən: "Bu nədir?"- deyə soruşdum. Dedi: "Bu, zinəti artırmaqdır!" Hədisi Əhməd rəvayət etmişdir. Hədisin isnadı Buxari və Muslim şərtinə uyğundur.[1]

**14) Dəniz suyundan ovuclanıb götürülsə belə, suya israf etməmək;** Ənəs ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ bir saadan[2] beş mudda qədər su ilə qüsl edər, bir mudla dəstəmaz alardı". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Abdullah ibn Yezid rəvayət edir ki, bir kişi ibn Abbasdan: "Dəstəmaz almaq üçün mənə nə qədər su bəs edər?"- deyə soruşdu. İbn Abbas: "Bir mudd!"- deyə cavab verdi. Kişi: "Bəs qüsl etmək üçün mənə nə qədər su kifayət edər?"- deyə soruşdu. İbn Abbas: "Bir saa!"- deyə cavab

---

[1] Hədis səhihdir. Təmamul Minnə, 1/93.

[2] Saa – ölçü vahididir və dörd mudda bərabərdir. Bir mudd isə insanın iki ovucuna bərabərdir. Bu da yeddi yüz qrama bərabərdir. (Səmərul Müstətab, 1/28).

verdi. Kişi: "Mənə bu qədər su bəs etməz"- dedikdə, ibn Abbas dedi: "Ay yazıq! Səndən də xeyirli olan Rəsulullaha ﷺ kifayət edərdi". Hədisi Əhməd, Bəzzar və Təbərani "Mocəm əl-Kəbir" əsərində səhih isnadla rəvayət etmişdir. Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ Sədin yanından keçdikdə o, dəstəmaz alırdı. Peyğəmbər ﷺ dedi: "Bu nə israfdır, ey Səd?" Səd dedi: "Məgər suda israf ola bilərmi?" Peyğəmbər ﷺ buyurdu: "Bəli, axar çayın başında olsan belə *israf ola bilər*!" Hədisi Əhməd və ibn Macə rəvayət etmişdir. Hədisin isnadında zəiflik var.[1] Suyu faydasız yerə istifadə etmək israf sayılır. Məsələn, dəstəmaz aldıqda əzaları üç dəfədən artıq yumaq israfdır. Amr ibn Şueyb atasından, o da babasından rəvayət edir ki, bədəvi *ərəb* Peyğəmbərin ﷺ yanına gəlib ondan dəstəmaz haqqında soruşdu. Peyğəmbər ﷺ *dəstəmaz əzalarını* üç dəfə, üç dəfə yuyub *bunu ona* göstərdikdən sonra buyurdu: "Budur dəstəmaz! Kim buna əlavə etsə, pis bir iş tutmuş, həddi aşmış və zülm etmiş olar". Hədisi Əhməd, Nəsai, ibn Macə və ibn Xuzeymə səhih isnadlarla rəvayət etmişdir.[2] Abdullah ibn Muğəffəl رضي الله عنه rəvayət edir ki, mən Peyğəmbərin ﷺ belə dua etdiyini eşitdim: "Tezliklə bu

---

[1] [Hədis həsəndir. Təracuat əl-Albani, 1/13; Silsilətul Əhadis əs-Səhihə, 3292.]

[2] [Hədis həsən-səhihdir. Səhih ən-Nəsai, 140.]

ümmətin içində təmizlik və dua xüsusunda həddi aşanlar olacaq". Hədisi Əhməd, Əbu Davud və ibn Macə rəvayət etmişdir.[1] Buxari demişdir: "Elm əhli dəstəmaz suyunu Peyğəmbərin ﷺ istifadə etdiyindən artıq istifadə etməyi bəyənilməyən əməllərdən hesab etmişlər".

**15) Dəstəmaz əsnasında dua etmək;** dəstəmaz əsnasında edilən dua barədə Peyğəmbərdən ﷺ heç bir hədis varid olmamışdır. Yalnız Əbu Musa əl-Əşarinin ؓ rəvayət etdiyi hədisdən başqa. O rəvayət edir ki, mən Peyğəmbərə ﷺ *dəstəmaz almaq üçün* su gətirdim və onun dəstəmaz alıb belə dua etdiyini eşitdim: "Allahım, mənim günahlarımı bağışla, evimi genişləndir və ruzimi bərəkətli et!"[2]

Mən dedim: "Ey Allahın Peyğəmbəri! Mən sənin filan duanı etdiyini eşitdim". O dedi: "Məgər sən bunun *dünya və axirətdə* xeyirli olduğunu görmürsənmi?!" Hədisi Nəsai rəvayət etmişdir.[3] Bu hədisi həmçinin ibn Sinni səhih isnadla rəvayət etmişdir.[4] Nəsai bu hədisi "Dəstəmazı bitir-

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 96.

[2] Ərəbcəsi:

(( اللَّهُمَّ اغْفِرْ لِي ذَنْبِي، وَوَسِّعْ لِي فِي دَارِي، وَ بَارِكْ لِي فِي رِزْقِي ))

Transkripsiyası: Allahummə-ğfir li zənbi, və vəssi li fi dari, və barik li fi rizqi.

[3] Bu hədisi Nəsai "Əməlul Yövm vəl-Leyl" əsərində rəvayət etmişdir. Təmamul Minnə, 1/95.

[4] Hədis zəifdir, Təmamul Minnə, 1/95. Ümumiyyətlə *hədisdə gələn* dua nə namaz, nə də dəstəmaz ilə heç bir əlaqəsi olmadan "həsən"dir. Təmamul Minnə, 1/96.

dikdən sonra oxunan dua" fəslində, ibn Sinni "Dəstəmaz əsnasında oxunan dua" fəslində rəvayət etmişdir. Nəvəvi: "Hər ikisi ehtimal edilir"- demişdir.

**16) Dəstəmazdan sonra dua etmək;** Ömər ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim tam şəkildə dəstəmaz aldıqdan sonra: "Mən şahidlik edirəm ki, Allahdan başqa məbud yoxdur, O təkdir, Onun şəriki yoxdur və şahidlik edirəm ki, Muhəmməd Onun qulu və elçisidir!"[1]- desə, onun üçün Cənnətin səkkiz qapısı açılar və o, istədiyi qapıdan içəri daxil ola bilər". Hədisi Muslim rəvayət etmişdir. Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim dəstəmaz aldıqdan sonra: "Allahım, Sən pak və müqəddəssən! Sənə həmd olsun. Şahidlik edirəm ki, Səndən başqa məbud yoxdur. Səndən bağışlanma diləyir, Sənə tövbə edirəm!"[2]- desə, bu sözlər ağ kağıza yazılar, sonra ağzına möhür vurular və Qiyamət gününədək açılmaz." Hədisi Təbərani "Əvsət" əsərində rəvayət etmiş-

---

[1] Ərəbcəsi:

(( أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ اللهُ وَحْدَهُ لاَ شَرِيكَ لَهُ وَأَشْهَدُ أَنَّ مُحَمَّدًا عَبْدُهُ وَرَسُولُهُ ))

Transkripsiyası: Əşhədu ən lə ilahə illəllahu vəhdəhu lə şərikə ləhu və əşhədu ənnə Muhəmmədən abduhu və Rasuluhu.

[2] Ərəbcəsi:

(( سُبْحَانَكَ اللَّهُمَّ وَبِحَمْدِكَ، أَشْهَدُ أَنْ لاَ إِلَهَ إِلاَّ أَنْتَ، أَسْتَغْفِرُكَ وَأَتُوبُ إِلَيْكَ ))

Transkripsiyası: Subhanəkəllahummə və bihəmdik, əşhədu ən lə ilahə illə ənt, əstəğfirukə və ətubu ileyk.

dir və isnadında olan ravilərin hamısı etibarlı ravilərdir. Bu hədisi həmçinin Nəsai rəvayət etmiş[1] və axırında bu sözləri əlavə etmişdir: "Onun ağzına möhür vurulduqdan sonra Ərşin altına qoyular və Qiyamət gününə qədər açılmaz." Hədis "mövquf"dur.[2] O ki qaldı: "Allahım, məni tövbə edənlərdən və təmizlənənlərdən et!"[3] duasına, bunu Tirmizi rəvayət etmiş və demişdir: "Bu hədisin isnadında anlaşılmazlıq və qeyri-müəyyənlik vardır. Bu mövzuda başqa mötəbər bir hədis yoxdur.[4]

**17) Dəstəmazdan sonra iki rükət namaz qılmaq;** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ Bilala belə dedi: "Ey Bilal! İslamda gördüyün ən yaxşı əməl barədə mənə xəbər ver. Çünki mən Cənnətdə gəzişərkən önümdə sənin ayaqqabılarının səsini eşitdim." Bilal dedi: "Mənim etdiyim ən gözəl əməl budur ki, istər gecə, istərsə də gündüz ikən hər hansı bir saatda dəstəmaz aldığım zaman mənə vacib buyurulmayan iki rükət namaz qılıram". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Üqbə ibn Amir ﵁ rəva-

---

[1] Bu hədisi Nəsai "Əməlul Yövm vəl-Leyl" əsərində rəvayət etmişdir. Təmamul Minnə, 1/97.

[2] Hədis məvquf olsa da, mərfu hökmündədir. Təmamul Minnə, 1/98.

[3] Ərəbcəsi:

(( اللَّهُمَّ اجْعَلْنِي مِنَ التَّوَّابِينَ وَاجْعَلْنِي مِنَ الْمُتَطَهِّرِينَ ))

Transkripsiyası: Allahumməcalni minət-təvvabinə vəcalni minəl-mutətahhirin.

[4] Hədis səhihdir. Təmamul Minnə, 1/97.

yət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim gözəl tərzdə dəstəmaz alıb iki rükət namaz qılar, qəlbini və üzünü buna yönəldərsə, Cənnətə girmək ona vacib olar". Hədisi Muslim, Əbu Davud, ibn Macə və ibn Xuzeymə "Səhih" əsərində rəvayət etmişdir. Osmanın azad etdiyi kölə – Humran rəvayət edir ki, Osman ibn Əffan su gətizdirib dəstəmaz aldı; qabdan su götürüb sağ əlinə tökdü və onu üç dəfə yudu; sonra sağ əlini qaba salıb *su götürdü və bununla* həm ağzını yaxaladı, həm də burnunun içini yudu; sonra üç dəfə üzünü və üç dəfə qollarını dirsəklərə qədər yudu; sonra başına məsh çəkdi; sonra üç dəfə ayaqlarını topuqlara qədər yudu, sonra da dedi: "Peyğəmbər ﷺ mən dəstəmaz aldığım kimi dəstəmaz aldıqdan sonra dedi: "Mənim kimi dəstəmaz alıb, qəlbindən heç bir şey keçirtmədən iki rükət namaz qılan kimsənin keçmiş günahları bağışlanar". Hədisi Buxari, Muslim və başqaları rəvayət etmişdir.

Gözlərin içini yumaq, üzdə olan qırışlara məsh etmək, üzüyü hərəkət etdirmək və boyuna məsh etmək kimi digər məsələləri bu fəsildə qeyd etmədik. Çünki nə qədər təmizlik baxımından bunlara əməl edilsə də, bu məsələlərə dair varid olmuş hədislər səhih dərəcəsinə çatmamışdır.

**5) Dəstəmazda bəyənilməyən əməllər;**

Dəstəmazın savabından məhrum olmamaq üşün dəstəmaz alan adamın yuxarıda qeyd olunmuş sünnələri tərk etməsi bəyənilmir. Çünki bəyənilməyən bir işi görmək adamı savabdan məhrum edir. Sünnəni tərk etmək isə bəyənilməyən bir əməldir.

**6) Dəstəmazı pozan amillər;**

Dəstəmazı pozan amillər aşağıdakılardır:

**1) Ön və arxa ifrazat çıxışlarından xaric olan hər bir şey; buna aşağıdakılar aiddir:**

**a) Sidik və nəcis ifraz etmək;** Uca Allah buyurur: **"...yaxud sizlərdən biri ayaq yolundan gəlibsə..."**[1] Burada "ayaq yolu" deyildikdə təbii ehtiyacları rəf etmək qəsd edilir.

**b) Arxa ifrazat çıxışından xaric olan yel;** Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz napak olduqda dəstəmaz almayınca Allah onun namazını qəbul etməz!" Hədrəmövtdən olan bir kişi dedi: "Napak olmaq nədir, ey Əbu Hureyra?" Əbu Hureyra ﵁ dedi: "Səsli və ya səssiz yel çıxarmaqdır". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Yenə Əbu Hureyradan ﵁ rə-

---

[1] "əl-Maidə" surəsi, 6.

vayət edilir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Sizdən biriniz qarnında bir şey hiss etsə, *sonra da* onun çıxıb çıxmadığını dəqiqləşdirə bilməsə, bir iy duymayınca və ya bir səs eşitməyincə məsciddən bayıra çıxmasın!" Hədisi Muslim rəvayət etmişdir. Dəstəmazın pozulmasında, qarından çıxan yelin səsini eşitmək və ya iyisini duymaq şərt deyil. Əsas odur ki, yelin çıxdığı yəqin edilsin.

**c) Məni,[1] məzi[2] və vədi[3];** məzi barədə Peyğəmbər ﷺ: "dəstəmaz almaq lazımdır"- demişdir. İbn Abbas رضي الله عنهما demişdir: "Məni ifraz olunduqda qüsl almaq gərəkdir". Məzi və vədi barəsində Peyğəmbər ﷺ buyurmuşdur: "Tənasül orqanını yu və namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al". Hədisi Beyhəqi "Sünən" əsərində rəvayət etmişdir.

**2) Dərin yuxu;** bu, bir yerə uzanmaq və ya söykənməklə insan şüurunun tamamilə fəaliyyətdən qalmasıdır. Səfvan ibn Əssal رضي الله عنه rəvayət edir ki, biz səfərdə olduğumuz zaman Peyğəmbər ﷺ bizə, – cənabət halı istisna olmaqla – nəcis, sidik və yuxuya görə üç gün üç gecə ayaqqabılarımızı çıxarmamağı, *onlara məsh çəkməyi* əmr edərdi." Hədisi Əhməd, Nəsai və Tirmizi rəvayət etmişdr. Tirmizi hədi-

---

[1] Sperma.

[2] Prostat şirəsi.

[3] Orqanizmin patoloji hallarda ifraz etdiyi sperma.

sin səhih olduğunu demişdir.[1] Lakin adam yerdə oturulu vəziyyətdə yuxulayarsa, dəstəmazı pozulmaz. Ənəs ﷺ rəvayət edir ki, Peyğəmbərin ﷺ səhabələri işa namazını o qədər gözləyərdilər ki, hətta başları aşağı düşərdi *(mürgüləyərdilər);* sonra qalxıb namaz qılar və dəstəmaz almazdılar". Hədisi Şafii, Muslim, Əbu Davud və Tirmizi rəvayət etmişdir. Tirmizinin Şöbəyə istinad edərək rəvayət etdiyi hədisdə Ənəs ﷺ demişdir: "Peyğəmbərin ﷺ səhabələrini işa namazını qılmaq üçün oyadardılar. Hətta onlardan bəzilərinin xorultusunu da eşidirdim. Sonra onlar qalxıb namazlarını qılar və dəstəmaz almazdılar". İbn Mübarək: "Bizim fikrimizə görə onlar oturulu halda mürgüləyərdilər"- demişdir.

**3) Ağılın getməsi;** istər dəlilik, istər ürəkgetmə, istər sərxoşluq, istərsə də dərman qəbul etmək nəticəsində huşunu itirmək eynidir. Bunun az və ya çox olması, oturulu və ya başqa bir vəziyyətdə olmasının heç bir fərqi yoxdur. Çünki bu durumda ağılın getməsi, yuxuda ikən onun getməsindən daha dərindir. Bu xüsusda alimlər həmrəydirlər.

**4) Övrət yerlərinə bilavasitə toxunmaq;** Busra bint Səfvan ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ buyurmuşdur: "Övrət yerinə toxunan kəs dəstəmaz almayınca namaz

---

[1] Hədis həsəndir. Səhih ət-Tirmizi, 96.

qılmasın!" Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi bu hədisin səhih olduğunu demişdir.[1] Buxari demişdir: "Bu məsələyə dair rəvayət edilmiş ən mötəbər hədis budur." Bunu həmçinin Malik, Şafii, Əhməd və digərləri rəvayət etmişlər. Əbu Davud rəvayət edir ki, mən Əhməd ibn Hənbələ: "Bu hədis səhih deyildir"- dedim. O isə: "Əksinə, bu hədis səhihdir"- dedi. Əhməd və Nəsainin Busradan rəvayət etdiyi digər hədisdə Peyğəmbər ﷺ demişdir: "Ayıb yerlərinə toxunduqda dəstəmaz almaq lazımdır".[2] Bu hədis, adamın həm öz ayıb yerlərinə, həm də başqasının ayıb yerlərinə toxunmağına aiddir. Əbu Hureyra ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Kim heç bir maneəsiz əlini övrət yerinə toxundurarsa, ona dəstəmaz almaq vacib olar". Hədisi Əhməd, ibn Hibban və Hakim rəvayət etmişdir.[3] Hakim və ibn Abdulbərr bu hədisin səhih olduğunu söyləmişlər. İbn əs-Səkən demişdir: "Bu xususda rəvayət olunmuş ən yaxşı hədis budur". Şafiinin rəvayət etdiyi hədisdə *Peyğəmbər ﷺ demişdir*: "Sizdən biriniz əlini heç bir maneəsiz övrət yerinə toxundurarsa, dəstəmaz alsın".[4] Amr ibn Şu-

[1] Hədis səhihdir. Səhih ət-Tirmizi, 82.
[2] Hədis səhihdir. Səhih və Daif Sunən ən-Nəsai, 164.
[3] Hədis səhihdir. Səhih əl-Cami, 362.
[4] Hədis zəifdir. Mişkatul Məsabih, 1/69.

eyb atasından, o da babasından rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Hansı bir kişi övrət yerinə toxunsa, dəstəmaz alsın; hansı bir qadın övrət yerinə toxunsa, dəstəmaz alsın!" Hədisi Əhməd rəvayət etmişdir.[1] İbn Qeyyim rəvayət edir ki, Hazimi belə demişdir: "Bu hədisin isnadı səhihdir". Lakin hənəfilər Təlqin ﷺ hədisini əsas gətirərək, ayıb yerlərinə bilavasitə toxunmağın dəstəmazı pozmadığını deyirlər. Hədisdə: "Bir kişi Peyğəmbərdən ﷺ: "Övrət yerinə toxunan kəs dəstəmaz almalıdırmı?"- deyə soruşdu. Peyğəmbər ﷺ: "Xeyr, o sənin bir parçandır"- deyə cavab verdi". Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. İbn Hibban bu hədisi səhih hesab etmişdir.[2] İbn Mədini demişdir: "Bu, Busranın hədisindən daha mötəbərdir".

**7) Dəstəmazı pozmayan amillər;**

Bu bölmədə biz, haqqında mötəbər bir dəlil varid olmadığı üçün, dəstəmazı pozmadığı halda dəstəmazı pozduğu güman edilən amillərə işarə etmək istədik. Bütün bunlar ətraflı olaraq aşağıda izah edilmişdir:

**1) Qadına bilavasitə toxunmaq;** Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ oruc tutmuş ikən məni öpdü və dedi:

---

[1] Hədis səhihdir. Səhih əl-Cami, 2725.
[2] Hədis səhihdir. Səhih Əbu Davud, 182.

“Öpmək, nə dəstəmazı pozar, nə də orucu!” Hədisi İshaq ibn Rahaveyh rəvayət etmişdir.[1] Bunu həmçinin Bəzzar yaxşı isnadla rəvayət etmişdir. Abdulhəqq demişdir: “Bu hədisi tərk etməyə vadar edə biləcək heç bir illə bilmirəm”. Aişə ﵂ rəvayət edir ki, bir gecə mən Peyğəmbərin ﷺ yatağında olmadığını görüb onu axtarmağa başladım. Peyğəmbər ﷺ məsciddə *səcdəyə qapanıb* ayaqlarını dik qoymuşdu. *Bu vaxt* mən əllərimi onun ayaqlarının altına qoydum. O, dua edib deyirdi: “Allahım! Sənin qəzəbindən razılığına, cəzandan əfvinə sığınıram. Səndən Sənə pənah aparıram. Mən Səni *layiqincə* tərif edə bilmərəm. Sən Özün Özünü tərif etdiyin kimisən!” Hədisi Muslim və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədisin səhih olduğunu demişdir. Yenə Aişədən ﵂ rəvayət edilir ki, “Peyğəmbər ﷺ qadınlarından birisini öpdü, sonra da dəstəmaz almadan namaza getdi”. Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə səhih isnadla rəvayət etmişlər.[2] Yenə Aişə ﵂ rəvayət edir ki, “mən Peyğəmbərin ﷺ qarşısında uzanıb yatırdım. Ayaqlarım da onun qiblə istiqamətində idi. O, səcdə etdikdə məni dümsükləyər, mən də ayaqlarımı yığardım”. Başqa bir ləfzdə isə “O, səcdə etmək istədikdə

---

[1] Hədis zəifdir. Silsilətul Əhadis əd-Daifə, 2/498; 999-cu hədis.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 178

ayaqlarımı dümsükləyərdi”- deyilir. Hədisi Buxari və Muslim rəvayət etmişdir.

**2) İfrazat çıxışlarından başqa bədənin digər bir yerindən qanın çıxması;** qanın yaradan axması yaxud qanalma yoluyla çıxması və ya burundan gəlməsi, habelə az və ya çox olması fərq etməz. Həsən ﷺ belə demişdir: “Müsəlmanlar indiyədək yaralı vəziyyətdə namaz qılmağa davam edirlər”. Bu hədisi Buxari rəvayət edib demişdir: “İbn Ömər ﷺ *üzündəki* sızanağı sıxdı və ondan qan çıxdı. Buna baxmayaraq o, dəstəmaz almayıb *namazını qıldı*.[1] İbn Əbu Əufə qan tüpürdüyü halda namazını qılmağa davam etdi.[2] Ömər ibn Xəttab ﷺ yarasından qan axdığı halda namazını qıldı.[3] Abbad ibn Bişr namaz qılarkən *uzaqdan atılan* bir ox gəlib ona batdı, lakin o, namazını qılmağa davam etdi”. Bu əsərləri Əbu Davud, ibn Xuzeymə, habelə Buxari “müəlləq” isnadla rəvayət etmişdir.

**3) Qusmaq;** istər ağız dolusu olsun, istər bundan az olsun, qusmağın dəstəmazı pozduğuna dair istinad ediləcək bir hədis varid olmamışdır.

---

[1] Hədis səhihdir. Şeyx Albani “Silsilətul Əhadis əd-Daifə, əsərində (2/47) belə demişdir: “Bunu ibn Əbu Şeybə “Müsənnəf” əsərində və Beyhəqi “Sünən” əsərində səhih isnadla rəvayət etmişdir”.

[2] Şeyx Albani “Silsilətul Əhadis əd-Daifə, əsərində (2/47) bu rəvayətin səhih olduğunu demişdir.

[3] Hədis səhihdir. İrvaul Ğəlil, 1/255; 209-cu hədis.

**4) Dəvə əti yemək;** bu da ki, raşidi xəlifələrin, həm də səhabələrin və tabiinlərin əksəriyyətinin rəyidir. Lakin qeyd etmək lazımdır ki, dəvə əti yedikdən sonra dəstəmaz almağın vacib olmasına dair rəvayət edilmiş hədis səhihdir. Cabir ibn Səmura ﵁ rəvayət edir ki, bir kişi Peyğəmbərdən ﷺ: "Qoyun əti yedikdən sonra dəstəmaz almalıyıqmı?"- deyə soruşdu. Peyğəmbər ﷺ: "İstəyirsən, dəstəmaz al, istəyirsənsə də, alma"- deyə cavab verdi. Kişi: "Dəvə əti yedikdən sonra dəstəmaz almalıyıqmı?"- deyə soruşdu. Peyğəmbər ﷺ: "Bəli, dəvə əti yedikdən sonra dəstəmaz almalısınız"- deyə cavab verdi. Kişi: "Qoyun ağılında[1] namaz qıla bilərəmmi?"- deyə soruşdu. Peyğəmbər ﷺ: "Bəli!"- deyə cavab verdi. Kişi: "Dəvə ağılında namaz qıla bilərəmmi?" - deyə soruşdu. Peyğəmbər ﷺ: "Xeyr!"- deyə cavab verdi". Hədisi Əhməd və Muslim rəvayət etmişdir. Bəra ibn Azib ﵁ rəvayət edir ki, Peyğəmbərdən ﷺ, dəvə əti yedikdən sonra dəstəmaz almaq barədə soruşdular. O: "Dəvə əti yedikdən sonra dəstəmaz almalısınız"- dedi. Ondan, qoyun əti yedikdən sonra dəstəmaz almaq haqqında soruşdular. O: "Qoyun əti yedikdən sonra dəstəmaz almayın"- dedi. Ondan, dəvə ağılında namaz qılmaq barədə soruşdular. O dedi: "Orada namaz

[1] Ağıl: içərisində mal-qara və qoyun saxlamaq üçün ətrafı tikan və ya ağac ilə hasarlanmış üstüaçıq yerdir.

qılmayın! Çünki onlar şeytandırlar". Ondan qoyun ağılında namaz qılmaq haqqında soruşdular. O buyurdu: "Orada namaz qıla bilərsiniz. Çünki onlarda bərəkət vardır". Hədisi Əhməd Əbu Davud və ibn Hibban rəvayət etmişdir.[1] İbn Xuzeymə demişdir: "Ravilər ədalətli olduğu üçün, bu hədisin rəvayət baxımından səhih olduğuna dair hədis alimlərinin ixtilaf etdiyini görməmişəm". Nəvəvi demişdir: "Əksər alimlərin rəyinə müxalif olsa da, bu rəy dəlil baxımından daha qüvvətlidir".

**5) Dəstəmazlı olan kimsənin dəstəmazı pozulduğuna şübhə etməsi;**

Dəstəmazı olan adam dəstəmazın pozulub pozulmadığına şübhə edərsə, istər namaz əsnasında, istərsə də namazdan kənar olsun, dəstəmazı pozulduğuna tam şəkildə əmin olmayınca, bu şübhə ona heç bir zərər yetirməz və dəstəmazını pozmaz. Abbad ibn Təmim əmisindən rəvayət edir ki, bir kişinin namaz əsnasında özündən sanki yel çıxdığını hiss etdiyini Peyğəmbərə ﷺ xəbər verdilər". Peyğəmbər ﷺ buyurdu: "Bir səs eşitməyincə və ya bir iy duymayınca namazdan çıxmasın!" Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir:

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 184

“Sizdən biriniz qarnında bir şey hiss etsə, *sonra da* onun çıxıb çıxmadığını dəqiqləşdirə bilməsə, bir iy duymayınca və ya bir səs eşitməyincə məsciddən bayıra çıxmasın!” Hədisi Muslim, Əbu Davud və Tirmizi rəvayət etmişdir. Dəstəmazın pozulmasında, qarından çıxan yelin səsini eşitmək və ya iyisini duymaq şərt deyil. Əsas odur ki, yelin çıxdığı yəqin edilsin. İbn Mübarək demişdir: “Bir adam dəstəmazının pozulduğuna şübhə etsə, and içə biləcək qədər qəti şəkildə dəstəmazının pozulduğuna əmin olmayınca dəstəmaz alması lazım gəlməz. Lakin dəstəmazının pozulduğunu yəqin bilib dəstəmaz alıb-almadığına şəkk edərsə, bütün müsəlmanların icmasına görə dəstəmaz alması gərəkdir”.

**6) Namaz əsnasında gülmək dəstəmazı pozmur.** Çünki bu xüsusda varid olan hədislər səhih deyildir.

**7) Haqqında rəvayət edilmiş hədislər zəif olduğundan ölünü yumaq dəstəmazı pozmur.**

## 8) Dəstəmaz almağı vacib edən əməllər;

Üç əməl vardır ki, bunları etmək üçün dəstəmaz almaq vacibdir:

**1) Namaz qılmaq üçün;** istər fərz, istər nafilə, istərsə də cənazə namazı olsun. Uca Allah buyurur: **“Ey iman**

**gətirənlər! Namaza durarkən üzünüzü və dirsəklərə qədər əllərinizi yuyun, başınıza məsh çəkin və topuqlara qədər ayaqlarınızı *yuyun.*"**[1] Yəni namaz qılmaq istədiyiniz zaman dəstəmazlı deyilsinizsə, dəstəmaz alın. Peyğəmbər ﷺ belə demişdir: "Allah, dəstəmazsız namazı və qənimətdən iznsiz olaraq götürülmüş maldan verilən sədəqəni qəbul etməz". Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

**2) Kəbəni təvaf etmək üçün;** ibn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ belə demişdir: "Təvaf da bir namazdır. Lakin Uca Allah təvaf əsnasında danışmağı halal buyurmuşdur. *Qoy təvafda* danışmaq istəyən kəs yalnız xeyir danışsın!" Hədisi Tirmizi, Daraqutni, Hakim, ibn Səkən və ibn Xuzeymə rəvayət etmişdir. Hakim bu hədisin səhih olduğunu söyləmişdir.[2]

**3) Qurana toxunmaq üçün;** Əbu Bəkr b. Muhəmməd b. Amr b. Həzm atasından, o da babasında rəvayət edir ki, Peyğəmbər ﷺ Yəmən əhlinə bir məktub göndərdi. Məktubda bu sözlər yazılmışdı: "Təmiz olmayan kəs Qurana toxunmasın!" Hədisi Nəsai, Daraqutni, Beyhəqi və Əsrəm rəvayət etmişdir.[3] İbn Abdulbərr bu hədis barəsin-

---

[1] "əl-Maidə" surəsi, 6.
[2] Hədis səhihdir. Səhih ət-Tirmizi, 960.
[3] Hədis səhihdir. İrvaul Ğəlil, 1/158, 122-ci hədis.

də belə demişdir: “İnsanlar bu hədisi qəbul etdiklərinə görə mütəvatir dərəcəsindədir”. Abdullah ibn Ömər رضي الله عنهما rəvayət edir ki, Peyğəmbər ﷺ demidir: “Təmiz olmayan kəs Qurana toxunmasın!” Bu hədisi Heysəmi “Məcməuz-Zəvaid” əsərində rəvayət etmiş və isnadında olan ravilərin etibarlı kişilər olduğunu söyləmişdir.[1] Bu hədis dəlildir ki, Qurana yalnız təmiz olanlar toxunmalıdır. Burada “təmiz olanlar” deyildikdə həm qüsl edib təmiz olanlar, həm də dəstəmaz alıb təmiz olanlar, eləcə də həm möminlər, həm də bədəni murdar olmayanlar qəsd edilə bilər. Deməli, bu hədisi müəyyən bir məsələyə aid etmək üçün ayrıca dəlil gətirmək lazımdır. Odur ki, bu hədis dəstəmazı olmayan kimsənin Qurana toxunmağını qadağan edən bir dəlil ola bilməz. Uca Allahın “Ona yalnız pak olanlar toxunur.”[2] ayəsinə gəlincə, bu ayənin zahirindən görünür ki, buradakı əvəzlik, qorunub saxlanılan Yazıya – Lövhi-məhfuza aiddir. Çünki bu cümlədə əvəzliyə yaxın olan – məhz odur. Təmiz olanlar deyildikdə isə mələklər qəsd edilir. Bu ayələr Uca Allahın: “*Bu Quran* kəramətli səhifələrdədir; yüksək və pak *səhifələrdədir*. *Bu səhifələr* elçilərin əllərində, möhtərəm və müti olanların *əllərindədir*.”[3] ayələ-

---

[1] Hədis səhihdir. Səhih əl-Cami, 7780.

[2] “əl-Vaqiə” surəsi, 79.

[3] “Əbəsə” surəsi, 13-16.

ri kimidir. İbn Abbas, Şəbi, Dəhhak, Zeyd ibn Əli, Mueyyid Billəh, Davud, ibn Həzm və Həmmad ibn Əbu Suleyman dəstəmazı olmayan kimsənin Qurana toxunmasının caiz olduğunu demişlər. Qurana toxunmadan oxumağa gəldikdə isə, alimlər bunun caiz olduğuna dair ittifaq etmişlər.

**9) Dəstəmaz almağı müstəhəb edən əməllər;**

Aşağıdakı əməlləri etmək üçün dəstəmaz almaq müstəhəbdir:

**1) Allahı zikr etdikdə;** Mühacir ibn Qunfuz ؓ rəvayət edir ki, Peyğəmbər ﷺ dəstəmaz alarkən o, Peyğəmbərə ﷺ salam verdi, lakin o, dəstəmazını alıb qurtarmayınca ona cavab vermədi. Dəstəmazını alıb qurtardıqdan sonra onun salamını alıb dedi: “Salamını almağa mənə mane olan şey mənim Allahı yalnız pak olduğum halda zikr etmək istəyimdir”. Qətadə dedi: “Elə buna görə də Həsən əl-Bəsri dəstəmaz almadan *Quran* oxumağı və ya Allahı zikr etməyi bəyənməzdi.” Hədisi Əhməd, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir.[1] Əbu Cuheym ibn Haris ؓ rəvayət edir ki, “bir dəfə Peyğəmbər ﷺ Birul-Cəməl[2] tərəfdən qayıtdıqda bir kişi ilə qarşılaşdı. Kişi ona

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 17.

[2] Mədinənin yaxınlığında yerləşən bir yer adıdır.

salam verdi, lakin o, kişinin salamını almadı. Nəhayət Peyğəmbər ﷺ bir divara yaxınlaşıb (əllərini ona vurdu), sonra üzünə və əllərinə məsh etdi, sonra da onun salamını aldı”. Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud və Nəsai rəvayət etmişdir. Belə etmək fəzilət baxımından daha yaxşıdır. Lakin qeyd etmək lazımdır ki, istər dəstəmazlı, istər dəstəmazsız, istərsə də cunub olan kimsənin, habelə ayaq üstə duran, yerdə oturan, yeriyən və uzanan kimsənin Allahı zikr etməsi caizdir. Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ hər cür vəziyyətdə Allahı zikr edərdi”. Hədisi Əhməd, Əbu Davud, Tirmizi və ibn Macə rəvayət etmişdir.[1] Buxari bu hədisi isnadsız rəvayət etmişdir. Əli ibn Əbu Talib رضي الله عنه rəvayət edir ki, “Peyğəmbər ﷺ ayaqyolundan çıxdıqdan sonra bizə Quran oxuyar və bizimlə ət yeyərdi. Cənabət halından başqa heç bir şey onu Quran oxumaqdan saxlamazdı”. Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi və ibn Səkən bu hədisin səhih olduğunu demişlər.[2]

**2) Yatmazdan əvvəl;** Bəra ibn Azib رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Yatağına uzandıqda namaz üçün dəstəmaz aldığın kimi dəstəmaz al, sonra sağ tərəfin üstə uzanıb de: “Allahım! Sənə ümid edərək və Səndən qorxa-

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 18.
[2] Hədis zəifdir. Daif ət-Tirmizi, 146.

raq canımı Sənə təslim etdim, işimi Sənə həvalə etdim, üzümü Sənə çevirdim, kürəyimi Sənə etibar etdim. Sığınacaq və Sənin əzabından xilas olmaq üçün nicat yeri yalnız Sənə yönəlməkdir. Sənin nazil etdiyin Kitaba və göndərdiyin Peyğəmbərə iman gətirdim!"[1] Hərgah o gecə ölsən, fitrət üzərində *müsəlman kimi* ölmüş olarsan. Qoy bu dua, sənin son sözün olsun!" Mən bu duanı Peyğəmbərin ﷺ hüzurunda təkrar etdim. Nəhayət gəlib: "Sənin nazil etdiyin Kitaba iman gətirdim" sözünə çatdıqda: "və göndərdiyin Elçiyə"- dedim. Peyğəmbər ﷺ buyurdu: "Xeyr,... və göndərdiyin Peyğəmbərə"- de." Hədisi Əhməd, Buxari və Tirmizi rəvayət etmişdir. Bu hədis daha çox cunub olan adama aiddir. İbn Ömər رضي الله عنهما rəvayət edir ki, mən: "Ey Allahhın elçisi! Bizdən birimiz cunub olduğu halda yata bilərmi?"- deyə soruşdum. O dedi: "Bəli! Əgər dəstəmaz alarsa, *yata bilər"*.[2] Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olduğu halda yatmaq istədikdə, övrət yerini

---

[1] Ərəbcəsi:

(( اللَّهُمَّ أَسْلَمْتُ نَفْسِي إِلَيْكَ، وَفَوَّضْتُ أَمْرِي إِلَيْكَ، وَوَجَّهْتُ وَجْهِي إِلَيْكَ، وَأَلْجَأْتُ ظَهْرِي إِلَيْكَ، رَغْبَةً وَرَهْبَةً إِلَيْكَ، لاَ مَلْجَأَ وَلاَ مَنْجَا مِنْكَ إِلاَّ إِلَيْكَ، آمَنْتُ بِكِتَابِكَ الَّذِي أَنْزَلْتَ وَبِنَبِيِّكَ الَّذِي أَرْسَلْتَ ))

Allahummə, əsləmtu nəfsi ileykə, və fəvvədtu əmri ileykə, və vəccəhtu vachi ileykə, və əlcətu zahri ileykə, rağbətən və rahmətən ileyk. Lə məlcəə və lə məncəə minkə illə ileyk. Aməntu bikitabikəl-ləzi ənzəltə və binəbiyyikəl-ləzi ərsəltə.

[2] [Əslində Peyğəmbərdən ﷺ ibn Ömər yox, Ömər soruşmuşdur. Hədisi Buxari və Muslim rəvayət etmişdir.]

yuyar, sonra da namaz qılmaq üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

**3) Cunub olduqda dəstəmaz almaq müstəhəbdir;** cunub halında olan kimsənin bir şey yemək, yaxud bir şey içmək, yaxud da təkrar cinsi əlaqəyə girmək istədiyi zaman dəstəmaz alması müstəhəbdir. Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ cunub olarkən bir şey yemək və ya yatmaq istədikdə namaz qılmaq üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı".[1] Əmmar ibn Yasir ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ cunub halında olan kimsənin bir şey yemək, yaxud bir şey içmək, yaxud da təkrar cinsi əlaqəyə girmək istədiyi zaman namaz qılmaq üçün dəstəmaz aldığı kimi dəstəmaz almasına izn verdi". Hədisi Əhməd və Tirmizi rəvayət etmişdir.[2] Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Sizdən biriniz öz zövcəsi ilə yaxınlıq etdikdən sonra bir daha yaxınlıq etmək istəsə, dəstəmaz alsın!" Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Bu hədisi ibn Xuzeymə, ibn Hibban və Hakim də rəvayət etmişdir. Onların rəvayətində bu əlavə də vardır: "Dəstəmaz almaq təkrar cinsi əlaqə üçün kişinin çevikliyini artırar".

---

[1] Hədisi Buxari və Muslim rəvayət etmişdir.
[2] Hədis zəifdir. Səhih və Daif ət-Tirmizi, 613.

**4) Qüsl əsnasında;** istər vacib, istərsə müstəhəb qüsl olsun, fərq etməz. Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ cunub ikən qüsl etdikdə birinci əllərini yuyar, sonra sağ əli ilə sol əlinin üzərinə su tökərək övrət yerlərini yuyar, sonra da namaz qılmaq üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmidir.

**5) Odda bişmiş şeylərdən yedikdən sonra;** İbrahim ibn Abdullah ibn Qariz rəvayət edir ki, mən Əbu Hureyranın yanından keçdikdə o dəstəmaz alırdı. O *mənə baxıb* dedi: "Nə üçün dəstəmaz aldığımı bilirsənmi? Mən yediyim qurut[1] tikələrindən dolayı dəstəmaz alıram. Çünki mən Peyğəmbərin ﷺ belə dediyini eşitmişəm: "Odda bişmiş şeylərdən (yedikdən sonra) dəstəmaz alın." Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Aişə رضي الله عنها rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Odda bişmiş şeylərdən yedikdən sonra dəstəmaz alın!" Hədisi Əhməd, Muslim, Nəsai, və ibn Macə rəvayət etmişdir. Burada olan əmr müstəhəb kimi qəbul edilir. Çünki Amr ibn Umeyyə əd-Damri رضي الله عنه demişdir: "Mən Peyğəmbərin ﷺ (bişmiş) qoyunun kürəyindən kəsib (yediyini) gördüm. Bu əsnada Peyğəmbər ﷺ na-

[1] Yumru-yumru edilib qurudulmuş şor, kəsmik, süzmə.

maza çağırıldı. Peyğəmbər ﷺ ayağa qalxdı, əlindəki bıçağı yerə atdı və dəstəmaz almadan namaza durdu". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Nəvəvi demişdir: "Bu hədisdən əti bıçaqla kəsib yeməyin caiz olduğu başa düşülür".

**6) Hər namaz üçün dəstəmazı təzələmək;** Bureydə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ hər namaz üçün dəstəmaz alardı. Məkkənin fəthi günü isə, dəstəmaz alıb xuflarının üstünə məsh çəkdi, sonra da bütün namazları bir dəstəmazla qıldı. Ömər ﵁ dedi: "Ey Allahın Elçisi! Sən heç vaxt görmədiyin bir işi gördün". Peyğəmbər ﷺ dedi: "Mən bunu bilərəkdən etdim, ey Ömər!" Hədisi Əhməd, Muslim və başqaları rəvayət etmişlər. İbn Amr ibn Amir əl-Ənsari rəvayət edir ki, Ənəs ibn Malik ﵁ belə dedi: "Peyğəmbər hər namaz üçün dəstəmaz alardı". Mən: "Siz necə edərdiniz?"- deyə soruşdum. O: "Biz, dəstəmazımız pozulmayınca bir dəstəmazla bir neçə namaz qılardıq"- deyə cavab verdi. Hədisi Əhməd və Buxari rəvayət etmişdir. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ümmətimə əziyyət olmasaydı, hər namazda dəstəmaz almağı və hər dəstəmazda misvakdan istifadə etməyi onlara əmr edərdim". Bu hədisi Əhməd "həsən" isnadla rəvayət et-

mişdir.[1] İbn Ömər ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ belə deyərdi: “Hər kim dəstəmazlı ikən dəstəmaz alarsa, ona on savab yazılar”. Hədisi Əbu Davud, Tirmizi və ibn Macə rəvayət etmişdir.[2]

**10) Dəstəmaz alan adamın ehtiyac duyduğu faydalı məsələlər;**

**1)** Dəstəmaz əsnasında danışmaq olar. Çünki Sünnədə bunu qadağan edən bir dəlil varid olmamışdır.

**2)** Əzaları yuyarkən dua oxumaq, əsli olmayan batil bir fikirdir. Bu xüsusda dəstəmazın sünnələri fəslində qeyd etdiyimiz duaları oxumaq kifayətdir.

**3)** Dəstəmaz alan adam əzaları neçə dəfə yuduğuna şübhə etsə, yəqinliyə əsaslanaraq az olanı götürməlidir.

**4)** Dəstəmaz əzalarından birinin üzərinə şam və boya kimi maddələrin düşməsi dəstəmaz almağa əngəl törədir və dəstəmaz qəbul olunmur. Lakin xına kimi ancaq rəngin olması dəstəmazı pozmur. Çünki o, suyun dəriyə çatmasına mane olmur.

**5)** İstihazəli[3] qadın, həmçinin sidiyini və ya qarnındakı yeli saxlaya bilməyən adam, yaxud başqa bu kimi üzürlü xəstəliyi olan kəs, – xəstəliyi davamiyyətli olub

---

[1] Hədis səhihdir. Tərğib vət-Tərhib, 1/48; 200-cü hədis.
[2] Hədis zəifdir. Daif ət-Tirmizi, 6.
[3] Qadınların uşaqlıq yolundan patoloji hallarda axan qan.

əlacı tapılmırsa, hər namaz üçün dəstəmaz almalıdır. Bu vəziyyətdə qılınan namaz səhih sayılır.

**6)** Dəstəmaz aldıqda başqasından yardım istəmək olar.

**7)** Dəstəmaz alan adam istər yayda, istərsə də qışda əzalarını dəsmalla qurulaya bilər.

## Xufların[1] üstünə məsh etmək

**1) Şəriət qanunu olduğuna dair dəlil;** xuflara məsh çəkməyə dair Peyğəmbərdən ﷺ neçə-neçə səhih hədislər rəvayət edilmişdir. Nəvəvi demişdir: "Alimlər ittifaq etmişlər ki, istər səfərdə, istərsə də daimi yaşayış yerində, ehtiyac olsa da, olmasa da xuflara məsh etmək caizdir. Hətta evdar qadınlara və xroniki xəstəliyə tutulanlara xufun üzərinə məsh etmək olar. Şiələrdən və xəvariclərdən başqa heç kəs məshi inkar etməmişdir. Bunların müxalif olması isə, elə bir əhəmiyyət kəsb eləmir". İbn Həcər "Fəthul Bari" əsərində demişdir: "Hədis alimləri, xufların üzərinə məsh etməyə dair hədislərin "mütəvatir" dərəcəsində olduğunu söyləmişlər. Bəziləri bu ravilərin sayının səksəndən yuxarı olduğunu, habelə on məşhur səhabənin də onların arasında olduğunu sübuta yetirmişlər. Məsh barəsində rəvayət olunmuş ən mötəbər hədis İmam Əhməd,

[1] Dəri ayaqqabılar.

Buxari, Muslim, Əbu Davud və Tirmizinin Həmmam ən-Nəxəidən ﵁ rəvayət etdiyi hədisdir. O demişdir: "Cərir ibn Abdullah subaşına çıxdıqdan sonra dəstəmaz aldı və xuflarının üstünə məsh çəkdi". Ondan: "Sən subaşına çıxdıqdan sonra məsh edirsən?"- deyə soruşduqda, o dedi: "Bəli! Mən Peyğəmbərin ﷺ subaşına çıxdıqdan sonra dəstəmaz alıb xuflarının üzərinə məsh etdiyini gördüm".[1] Bu hədisin ravilərindən biri – İbrahim demişdir: "Bu hədis onların xoşuna gəlirdi. Çünki Cərir ibn Abdullah ﵁ İslam dinini, əl-Maidə surəsi nazil olduqdan sonra qəbul etmişdi. Yəni, Cərir ﵁ ayaqların yuyulmasını vacib buyuran dəstəmaz ayəsi nazil olduqdan (dörd və ya beş il) sonra hicrətin onuncu ilində, İslam dinini qəbul etmişdir. Onun hədisi bu məsələyə aydınlıq gətirir. Demək, bu ayə ayağı yalın olanlara ayaqlarını yumağı, hədis isə ayağında xuf olanlara məsh çəkməyi buyurur. Beləliklə də bu hədis ayəni təxsis etmiş olur".

**2) Corablar üzərinə məsh etməyin qanuni olması;** corabların üzərinə məsh etmək caizdir. Səhabələrin çoxundan buna dair hədislər rəvayət edilmişdir. Əbu Davud demişdir: "Əli ibn Əbu Talib, ibn Məsud, Bəra ibn Azib, Ənəs ibn Malik, Əbu Umamə, Səhl ibn Səd və Amr ibn

---

[1] Hədis həsəndir. Səhih Əbu Davud, 154.

Hureys corabların üzərinə məsh etmişlər". Bu rəy, Ömər ibn Xəttab və ibn Abbasdan da rəvayət olunmuşdur. Habelə Əmmar, Bilal, Abdullah ibn Əbu Əufə və ibn Ömər də bu fikirdə olmuşlar. İbn Qeyyim "Təhzib əs-Sünən" əsərində ibn Munzirin belə dediyini nəql etmişdir: "İmam Əhməd corabların üzərinə məsh etməyi açıq-aydın bildirmişdir. Bu da onun insaflı və ədalətli olduğunu göstərir. Onun əsaslandığı dəlil, yuxarıda adları çəkilən səhabələrin rəyi və açıq-aydın qiyasdır. Çünki corablarla xuflar arasında önəmli bir fərq yoxdur. Odur ki, corabların üzərinə məsh çəkməyə dair hökm səhihdir. Onların üzərinə məsh çəkmək əksər elm əhlinin rəyidir. Süfyan əs-Sövri, ibn Mübarək, Əta, Həsən və Səid ibn Museyyib də corablar üzərinə məsh etməyin caiz olduğunu söyləmişlər. Əbu Yusuf və Muhəmməd belə demişlər: "Əgər corablar nazik deyil, qalındırsa, onların üzərinə məsh çəkmək olar". Əbu Hənifə qalın corabların belə üzərinə məsh etməyi caiz hesab etmirdi. Lakin ölümündən üç və ya yeddi gün əvvəl, xəstə ikən qalın corablarının üzərinə məsh çəkdi və ona baş çəkməyə gəlmiş adamlara: "Əvvəllər qadağan etdiyim bir şeyi indi özüm edirəm"- dedi.

Muğirə ibn Şöbə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ dəstəmaz alarkən corablarının və ayaqqabılarının üzərinə məsh

etdi”. Hədisi Əhməd, Təhavi, ibn Macə və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədisin həsən-səhih olduğunu demişdir. Əbu Davud isə bu hədisi zəif hesab etmişdir.[1] Bu hədisdən məqsəd corabların üzərinə məsh çəkməyi isbat etmək idi. Ayaqqabıların üzərinə məsh etmək isə buna aid bir məsələ olaraq qeyd edilmişdir. Corabların üzərinə məsh etmək caiz olduğu kimi, ayaqları örtən sarğı və buna bənzər şeylərin üzərinə məsh etmək də caizdir. Sarğı, soyuqdan qorunmaq və ya ayaqyalın yeriməmək, yaxud ayaqdakı yaranı qorumaq və başqa bu kimi məqsədlər üçün ayağa sarılan şeydir. İbn Teymiyyə demişdir: “Sarğıların üzərinə məsh etmək doğru fikirdir. Sarğıların üzərinə məsh etmək, xuf və corablara nisbətən daha münasibdir. Çünki sarğılar çox vaxt ehtiyac üçün istifadə edilir və çıxarılmasında zərər ola bilər. Ya soyuq dəyə bilər, ya ayaqyalın yeridikdə ayağa bir şey bata bilər, ya da ayaqdakı yaralar açıla bilər. Və əgər xufların və corabların üzərinə məsh etmək caizdirsə, onda sarğılar üzərinə məsh etmək də caizdir. Bunun caiz olmadığını və bütün alimlərin bu fikirdə olduğunu isə yalnız savadsız adam iddia edə bilər. O, bunun caiz olmadığına dair nəinki bütün alimlərdən, heç on məşhur alimdən belə əsaslı bir rəy gətirə

---

[1] Hədis həsəndir. Səhih Əbu Davud, 159.

bilməz... Peyğəmbərin ﷺ buna dair söylədiklərini düşünən və bunları doğru-düzgün şəkildə müqayisə edən kəs bu xüsusda rüsxətin geniş olduğunu, həm də onun şəriətin gözəlliklərindən və ən asan din olaraq göndərilmiş İslamın rüsxətlərindən olduğunu başa düşər."[1] Nə qədər ki, xuf və ya corab ayağa geyilir, onlarda deşik olsa da belə onların üzərinə məsh etmək caizdir. Sövri demişdir: "İndiki dövrdə olduğu kimi mühacirlərin və ənsarın xuflarında da deşiklər var idi. Əgər bunun bir qorxusu olsaydı, onlardan məsh çəkməyin caiz olmadığına dair bir rəvayət varid olardı".

**3) Xuf və onun hökmündə olanların üzərinə məsh çəkməyin şərtləri;** xuf və onun hökmündə olanların üzərinə məsh etməyin caiz olması üçün ayağı örtən hər bir şeyi dəstəmazlı ikən geyinmək şərtdir. Muğirə ibn Şöbə رضي الله عنه rəvayət edir ki, mən bir gecə səfərdə Peyğəmbər ﷺ ilə bir yerdə idim. Su qabından onun *əllərinə* su tökdüm. O, üzünü və qollarını yudu, başına da məsh etdi. Sonra mən əyilib onun xuflarını çıxarmaq istədikdə dedi: "Toxunma onlara! Mən onları *ayaqlarım* təmiz olduğu halda geyinmişəm". Hədisi Əhməd, Buxari və Muslim rəvayət etmişdir. Humeydi "Müsnəd" əsərində belə rəvayət etmişdir: "Biz

---

[1] Məcmuə Fətavə, 21/185.

dedik: “Ey Allahın Elçisi! Bizdən birimiz xufları üzərinə məsh edə bilərmi?” Peyğəmbər ﷺ buyurdu: “Əgər onları *ayaqları* pak olduğu halda geyinibsə, *məsh* edə bilər”. Bəzi fəqihlərin qoyduğu, xuffun dəstəmazda yuyulacaq yerləri örtməsi, ipsiz olaraq, öz-özünə dik durması kimi şərtlərə gəlincə, ibn Teymiyyə öz fətvalarında bu fikirlərin zəif olduğunu bəyan etmişdir.

**4) Məsh ediləcək yer;** şəriətə görə məsh ayağın üst tərəfinə çəkilir. Muğirə ibn Şöbə ؓ rəvayət edir ki, mən Peyğəmbərin ﷺ xufların üstünə məsh etdiyini gördüm. Hədisi Əhməd, Əbu Davud və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədisin həsən olduğunu demişdir.[1] Əli ibn Əbu Talib ﷺ belə demişdir: “Əgər din rəy ilə olsaydı, xuffun altına məsh etmək daha münasib olardı. Lakin mən Peyğəmbərin ﷺ xufların üstünə məsh etdiyini gördüm”. Hədisi Əbu Davud və Daraqutni rəvayət etmişdir. Bu hədisin isnadı həsən və ya səhihdir.[2] Məsh etməkdə vacib olan budur ki, heç bir hədd qoymadan düzgün şəkildə məsh edilsin. Belə ki, məshin hüdudları xüsusunda heç bir dəlil varid olmamışdır.

**5) Məshin vaxtı;** xuf üzərinə məsh etməyin müddəti, yerli sakin üçün bir gün bir gecə, səfərdə olan üçün isə üç

[1] Hədis həsən-səhihdir. Səhih ət-Tirmizi, 98.
[2] Hədis səhihdir. Səhih Əbu Davud, 162.

gün üç gecədir. Səfvan ibn Əssal ﷺ rəvayət edir ki, biz dəstəmazlı ikən ayaqqabılarımızı geyindikdə, Peyğəmbər ﷺ bizə, səfərdə olduğumuz zaman üç gün üç gecə, yurdumuzda olduqda isə bir gün bir gecə *onlara məsh çəkməyi* əmr edərdi. Biz onları yalnız cunub olduğumuz zaman çıxarardıq". Hədisi Şafii, Əhməd, ibn Xuzeymə, Tirmizi və Nəsai rəvayət etmişdir. Tirmizi və Nəsai bu hədisi səhih hesab etmişlər.[1] Şureyh ibn Hani ﷺ rəvayət edir ki, mən Aişədən xufların üzərinə məsh çəkmək barəsində soruşdum. Dedi: "Sən Əlidən soruş! Çünki bu məsələni o məndən daha yaxşı bilir. O, Peyğəmbərlə ﷺ birgə neçə-neçə səfərlərdə olub". Mən bu haqda Əli ibn Əbu Talibdən ﷺ soruşduqda o dedi: "Müsafirə üç gün üç gecə, evində olana isə bir gün bir gecə *məsh etməyə izn verilmişdir*". Hədisi Əhməd, Muslim, Tirmizi, Nəsai və ibn Macə rəvayət etmişdir. Beyhəqi demişdir: "Bu xüsusda rəvayət edilmiş ən mötəbər hədis budur". Daha doğru olan budur ki, məshin müddəti, *dəstəmaz aldıqdan sonra* ilk dəfə məsh çəkildiyi vaxtdan başlayır. Bəziləri isə: "məshin müddəti xufları geyindikdən sonra dəstəmaz pozulduğu vaxtdan başlayır"- demişlər.

**6) Məsh etməyin qaydası;** dəstəmaz alan adam dəstəmazını tamamladıqdan sonra ayaqlarına xuf və ya corab

---

[1] Hədis həsən-səhihdir. Səhih ən-Nəsai, 127.

geyinsə, hər dəfə dəstəmaz aldıqda ayaqlarını yumayıb onların üzərinə məsh çəkə bilər. Belə olduğu təqdirdə ona, yaşadığı yerdə bir gün bir gecə, səfərdə olduğu müddətdə isə üç gün üç gecə məsh çəkməyə rüsxət verilir. Yalnız cunub olduğu hal istisnadır. Belə ki, bu vəziyyətdə, yuxarıda qeyd etdiyimiz, Səfvandan rəvayət edilən hədisə əsasən onları çıxardıb ayaqları yumaq vacibdir.

**7) Məshi pozan amillər;**

Məshi pozan amillər bunlardır:

a) Vaxtın sona çatması; [1]

b) Cunub olmaq;

c) Xufu çıxarmaq;[2] Dəstəmazlı ikən *məshin* vaxtı bitərsə və ya xufu çıxartmışdırsa, onda yalnız ayaqlar yuyulmalıdır.

## Qüsl

Qüsl, bədənin hər yerini su ilə yumaq deməkdir. Qüsl, şəriət tərəfindən vacib buyurulmuşdur. Uca Allah buyurur: ***"Yaxınlıq edib* natəmiz olmuşsunuzsa, qüsl edin".**[3]

---

[1] Vaxtın sona çatmasına görə məshin pozulmasına dair heç bir dəlil yoxdur. Təmamul Minnə, 1/114.

[2] Xufu çıxardıqda məshin pozulmasına dair heç bir dəlil yoxdur. Təmamul Minnə, 1/114.

[3] "əl-Maidə" surəsi, 6.

Həmçinin buyurur: **“Səndən heyz barəsində soruşurlar. De: “Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlarla** ***yaxınlıq etməkdən*** **uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin. Onlar təmizləndikdən sonra isə Allahın sizə buyurduğu yerdən onlara yaxınlaşın”. Şübhəsiz ki, Allah tövbə edənləri də sevir, pak olanları da”.**[1]

## Qüslü vacib edən amillər

Beş halda qüsl etmək vacibdir:

**1) Məni[2] çıxdıqda;** yuxuda və ya ayıq ikən, qadından və ya kişidən məninin şəhvətlə çıxması qüslü vacib edir. Bu, bütün fəqihlərin rəyidir. Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: “Su, suya görədir[3]”. Hədisi Muslim rəvayət etmişdir. Ummu Sələmə ﵂ rəvayət edir ki, Ummu Suleym belə dedi: “Ey Allahın Elçisi! Allah haqqı deməkdən çəkinməz. Qadın pollyusiya[4] halına düşdükdə qüsl etməlidirmi?” Peyğəmbər ﷺ buyurdu: “Bəli, əgər su görübsə (məni axıdıbsa), etməlidir!” Hədisi Buxari, Muslim və qeyriləri rəvayət etmişdir.

---

[1] “əl-Bəqərə” surəsi, 222.

[2] Sperma.

[3] Su, suya görədir: yəni qüsl etmək, sperma axıtdıqda vacib olur.

[4] Yuxuda ikən sperma axıtmaq.

Bu xüsusda baş verən bəzi hallar vardır ki, bunları qeyd etməyimiz gərəkdir:

a) Məni,[1] şəhvətsiz olaraq, xəstəlikdən və ya soyuqdəymədən dolayı çıxdıqda qüsl etmək vacib deyildir. Əli ibn Əbu Talib ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ ona belə buyurmuşdur: "Təkanla məni axıtsan, qüsl et!" Hədisi Əbu Davud rəvayət etmişdir.[2] Mücahid rəvayət edir ki, biz – ibn Abbasın ﵄ dostları – Səid ibn Cubeyr, Taus və İkrimə məsciddə dövrə vurub oturmuşduq. Bu vaxt ibn Abbas ﵄ namaz qılırdı. Bu dəmdə bir kişi gəlib başımızın üstə durdu və: "Aranızda müfti varmı?"- deyə soruşdu. Biz: "Soruş!"- dedik. Kişi dedi: "Mən hər dəfə subaşına çıxanda sidiyin arxasınca bir su ifraz olur". Biz soruşduq: "Uşaq əmələ gəldiyi sudurmu?" Kişi: "Bəli"- deyə cavab verdi. Biz: "Sən qüsl etməlisən"- dedik. Kişi: "İnnə lillahi və innə ileyhi raciun (biz, Allaha məxsusuq və Ona da qayıdacağıq!)"- deyib getdi. İbn Abbas namazını tələsik qılıb İkriməyə: "Kişini yanıma çağırın"- dedi. Kişi bizim yanımıza gəldikdə ibn Abbas bizdən: "Siz bu adama Allahın Kitabındanmı fətva verdiniz?"- deyə soruşdu. Biz: "Xeyr!"- deyə cavb verdik. O: "Rəsulullahın ﷺ sünnəsindənmi?"- deyə soruşdu. Biz: "Xeyr!"- deyə cavab verdik. O: "Peyğəm-

---

[1] Sperma.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 193.

bərin ﷺ səhabələrindənmi?"- deyə soruşdu. Biz: "Xeyr!"- deyə cavab verdik. Onda o dedi: "Yaxşı bəs nə ilə fətva verdiniz?" Biz: "Öz rəyimizlə!"- deyə cavab verdik. Dedi: "Elə buna görə də Rəsulullah ﷺ demişdir ki: "Bir fəqih, şeytana qarşı min abiddən daha qüvvətlidir!"[1] Mücahid deyir ki, ibn Abbas kişiyə tərəf dönüb: "O su səndən çıxdıqda şəhvət hiss edirsənmi?"- deyə soruşdu. Kişi: "Xeyr!"- dedi. İbn Abbas: "Bədənində bir süstlük hiss edirsənmi?"- deyə soruşdu. Kişi: "Xeyr!"- dedi. Onda ibn Abbas: "Bu, soyuqdəymədən əmələ gəlmişdir. Sənə dəstəmaz almaq kifayət edər".

b) Pollyusiya halına düşdükdən sonra mənidən əsər-əlamət görmədikdə qüsl etmək vacib deyildir. Bu məsələdə bütün alimlər həmrəydirlər. Yuxarıda qeyd edilmiş hədisdə Ummu Suleym رضي الله عنها Peyğəmbərdən ﷺ: "Qadın pollyusiya halına düşdükdə qüsl etməlidirmi?"- deyə soruşduqda Peyğəmbər ﷺ belə buyurmuşdur: "Bəli, əgər su görübsə (məni axıdıbsa), etməlidir!" Bu hədis dəlildir ki, əgər o, su görməsə, qüsl etməsi vacib deyildir. Və əgər yuxudan oyandıqdan sonra məni gəlmiş olsa, qüsl etmək vacib olar.

c) Yuxudan oyanıb alt paltarının yaş olduğunu görən adam ihtilam olduğu (yuxuda qadınla yaxınlıq etdiyi) ya-

[1] Lap zəifdir. Təmamul Minnə, 1/115.

dına gəlmirsə, bunu dəqiqləşdirməli və alt paltarındakı rütubətin məni olduğunu yəqin etdiyi təqdirdə qüsl almalıdır. Çünki o, ihtilam olduğunu unuda bilər. Yox əgər şəkk edib bunun məni olub-olmadığını yəqin bilməsə, ehtiyat üçün qüsl almalıdır. Mücahid və Qətadə demişdir: "Bunun məni olduğuna əmin olmayınca, qüsl etmək ona vacib olmaz. Çünki onun təmiz qaldığı dəqiqdir və bu təmizlik heç bir şəkk-şübhə ilə aradan qalxa bilməz".

d) Hər kim şəhvəti oyandıqdan sonra məni gəldiyini hiss edib tənasül orqanını sıxmaqla məninin bayıra çıxmasının qarşısını alsa, qüsl etmək ona vacib olmaz. Çünki Peyğəmbər ﷺ qüsl etməyi məninі görməklə əlaqələndirmişdir. Deməli, məninі görməyincə qüsl etmək vacib deyildir. Lakin yeriməyə başladıqda məni axsa, qüsl etmək ona vacib olar.

e) Paltarında məni görüb onun nə zaman çıxdığını bilmirsə, və namazını qılmışdırsa, yuxudan oyandığı vaxtdan bəri qıldığı namazları yenidən qılmalıdır. Hərgah daha öncə çıxdığını dəqiqləşdirərsə, onda çıxdığı andan bu yana qıldığı namazlarını təkrar qılmalıdır.

**2) Cinsiyyət üzvləri bir-birinə toxunduqda;** kişilik əzasının başı qadının cinsiyyət orqanında qeyb olsa, məni axıtmasa da belə qüsl etmək vacib olar. Uca Allah buyu-

rur: ***“Yaxınlıq edib* natəmiz olmuşsunuzsa, qüsl edin”.**[1] Şafii demişdir: “Ərəblər cənabət halı dedikdə, cinsi əlaqəni qəsd edirlər. Bu yaxınlıq əsnasında məni axmış olmasa da belə, onlar bunu cənabət halı adlandırırlar. Əgər birisinin barəsində: “o, filankəslə yaxınlıq edib”- deyilərsə, məni axıtmış olmasa da, o qadınla cinsi əlaqəyə girdiyi başa düşülər. Alimlər həmrəydirlər ki, zina edən kimsə məni axıtmış olmasa da, qamçıyla cəzalandırılmalı və ya daşqalaq olunmalıdır. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: “(Kişi) qadının dörd əzası[2] arasında oturub onunla cinsi əlaqəyə girərsə, məni axıtsa da, axıtmasa da, (hər ikisinə) qüsl etmək vacib olar”. Hədisi Əhməd və Muslim rəvayət etmişdir. Səid ibn Museyyib rəvayət edir ki, Əbu Musa əl-Əşari ﵁ Aişəyə dedi: “Mən səndən bir şey barəsində soruşmaq istəyirəm, lakin səndən utanıram”. Aişə dedi: “Səni dünyaya gətirən anandan soruşacağın bir şeyi məndən soruşmaqdan utanma. Həqiqətən, mən də sənin ananam!” Mən: “Qüslü vacib edən şey nədir?”– deyə soruşdum. Dedi: “Sən (bu sualın cavabını) bilən adama rast gəlmisən. Peyğəmbər ﷺ buyurmuşdur: “(Kişi) qadının dörd əzası arasında oturduğu və sün-

---

[1] “əl-Maidə” surəsi, 6.

[2] Burada dörd əza deyildikdə ya qadının ayaqları və əlləri, ya da cinsiyyət üzvünün sağ və sol tərəfləri nəzərdə tutulur.

nət edilmiş əza sünnət edilmiş əzaya toxunduğu[1] zaman qüsl etmək vacib olar". Hədisi Əhməd, Muslim və Malik ayrı-ayrı ləfzlərlə rəvayət etmişdir. Bu vəziyyətdə kişilik əzasının qadının cinsi orqanına daxil olması şərtdir. Əgər cinsi əlaqə olmadan bu orqanlar *zahirən* bir-birinə toxunsa, nə qadına, nə də kişiyə qüsl etmək vacib olmaz.

**3) Heyz və ya nifas qanı kəsildikdə;** Uca Allah buyurur: **"Heyz vaxtı qadınlarla *cinsi əlaqəyə girməkdən* kənar olun və pak olmayınca onlarla yaxınlıq etməyin. Onlar təmizləndikdən sonra isə Allahın sizə buyurduğu yerdən onlara yaxınlaşın".**[2] Peyğəmbər ﷺ Əbu Hubeyşin qızı Fatiməyə belə buyurmuşdur: "Heyz olduğun günlərdəki namazları burax. *Heyz qanı kəsildikdən* sonra qüsl et və namaz qıl!" Hədisi Buxari və Muslim rəvayət etmişdir. Bu dəlillər heyz barəsində varid olsa da, səhabələrin yekdil rəyinə əsasən nifas da heyz hökmündədir.

Hərgah uşaq olduqdan sonra qan gəlməsə, bəzi alimlərin fikrinə görə qadın qüsl etməli, digərilərin rəyinə görə isə qüsl etməməlidir. Buna dair heç bir dəlil varid olmamışdır.

**4) Ölüm;** müsəlman bəndə vəfat etdikdə onu yuyub qüsl etmək vacibdir. Bu məsələ gələcək fəsillərdə müfəssəl şəkildə izah ediləcəkdir.

---

[1] Burada cinsi əlaqəyə girmək qəsd edilir.

[2] "əl-Bəqərə" surəsi, 222.

**5) Kafir İslamı qəbul etdikdə;** kafir İslamı qəbul etdikdə qüsl almalıdır. Əbu Hureyra ﷺ rəvayət edir ki, Sumamə əl-Hənəfi əsir düşdü. Peyğəmbər ﷺ onun yanına gəlib: "Nə düşünürsən, ey Sumamə?"- deyə soruşdu. Sumamə dedi: "Məni öldürsən, əli qana batmış bir canini öldürmüş olarsan. Məni azad etsən, minnətdar olan bir adama yaxşılıq etmiş olarsan. Yox əgər pul istəyirsənsə, dilədiyin qədər istəyə bilərsən". Peyğəmbərin ﷺ səhabələri əsirləri fidyə müqabilində azad etməyi xoşlayar və: "Bunu öldürməklə nə əldə edəcəyik?"- deyərdilər. Peyğəmbər ﷺ Sumamənin yanına gəlib onu dəvət etdi və o da müsəlman oldu. Peyğəmbər ﷺ onu azad edib Əbu Təlhənin bostanına göndərdi və ona qüsl etməyi əmr etdi. O da qüsl edib iki rükət namaz qıldı. Peyğəmbər ﷺ dedi: "Qardaşınızın İslamı qəbul etməsi çox gözəl oldu". Hədisi Əhməd rəvayət etmişdir. Əsli isə Buxari və Muslimin rəvayətlərindədir.

## Cənabət halında olan adama haram olan əməllər

Cənabət halında olan adama haram olan əməllər bunlardır:

**1) Namaz qılmaq;**

**2) Kəbəni təvaf etmək;**

Bunlara dair dəlillər dəstəmaz almağı vacib edən əməllər fəsilində qeyd edilmişdir.

**3) Qurana toxunmaq və onu götürmək;** cunub olduqda Qurana toxunmağın və onu ələ götürməyin haram olduğuna dair imamlar ittifaq etmişlər. Həmçinin əshabələrdən heç biri buna müxalif olmamışdır. Lakin zahirilərin imamlarından olan Davud və ibn Həzm, Buxari və Muslimin "Səhih" əsərlərində varid olmuş hədisi əsas gətirərək cunub olan kimsənin Qurana toxunmasının və onu əlinə götürməsinin caiz olduğunu, bunda bir eyib olmadığını demişlər. Hədisdə rəvayət edilir ki, Peyğəmbər ﷺ *kafir* Herakla göndərdiyi məktubda bu sözlər yazılmışdır:

**Mərhəmətli, Rəhmli Allahın adı ilə!**

Allahın qulu və rəsulu Muhəmməddən Rum imperatoru Herakla. Haqq yolu tutub gedənlərə salam olsun! Bundan sonra, mən səni İslama dəvət edirəm. İslamı qəbul et ki, salamat qalasan və Allah sənin mükafatını ikiqat versin. Əgər qəbul etməsən, tabeçiliyində olanların günahı sənin boynunda qalacaqdır. *Sənə Allahın mənə buyurduğunu deyirəm:* **“Ey Kitab əhli! Bizim və sizin aranızda olan eyni bir kəlməyə gəlin ki, Allahdan başqasına ibadət etmə-**

**yək, Ona heç bir şeyi şərik qoşmayaq və Allahı qoyub bir-birimizi ilahiləşdirməyək. Əgər onlar üz döndərsələr, deyin: "Şahid olun ki, biz müsəlmanlarıq!"**[1] İbn Həzm belə demişdir: "Bu məktubu Peyğəmbər ﷺ göndərmişdir. Həmin məktubda xristianlara aid bir ayə də yazılmışdır. Peyğəmbər ﷺ yəqin bilirdi ki, kafirlər ona toxunacaqlar". Alimlər buna belə cavab vermişlər: "Bu bir məktubdur. İçində Quran ayələri olan məktublara, təfsir, fiqh və digər kitablara toxunmaqdan bir günah gəlməz. Çünki bunlara Quran deyilmir, həm də haram olduğuna dair heç bir dəlil varid olmamışdır".

**4) Quran oxumaq;** əksər alimlərin rəyinə görə cunub halında olan kimsəyə Quran oxumaq haramdır. Əli ibn Əbu Talib ؓ rəvayət edir ki, cənabət halından başqa heç bir şey Peyğəmbəri ﷺ Quran oxumaqdan saxlamazdı". Hədisi Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi və digərləri bu hədisin səhih olduğunu demişlər.[2] İbn Həcər "Fəthul Bari" əsərində belə demişdir: "Bəziləri bu hədisin isnadındakı bəzi raviləri etbarsız hesab etmişlər. Lakin həqiqət budur ki, bu hədis "həsəndir" və dəlil göstərmək üçün yararlıdır. Yenə Əli ibn Əbu Ta-

[1] "Ali-İmran" surəsi, 64.
[2] Hədis zəifdir. Daif Əbu Davud, 229.

lib ﷺ rəvayət edir ki, Peyğəmbər ﷺ dəstəmaz alıb Quran oxudu, sonra da belə buyurdu: "Cunub halında olmayan kəs belə edə bilər. Lakin cunub halında olan adam bir ayə belə oxuya bilməz". Hədisi Əhməd və Əbu Yələ rəvayət etmişdir. Bu, Əbu Yələnin rəvayətidir. Heysəmi bu hədisin isnadında olan ravilərin etibarlı ravilər olduğunu xəbər vermişdir.[1] Şövkani belə demişdir: "Əgər bu hədis səhihdirsə, onda onu, cunub halda Quran oxumağın haram olduğuna dair dəlil gətirmək olar. Əvvəlki hədisə gəldikdə isə, hədis heç də cunub halda Quran oxumağın haram olduğuna dəlalət etmir. Burada məqsəd, Peyğəmbərin ﷺ cunub halında ikən Quran oxumağı tərk etməsidir. Bu kimi ifadələr əməlin məkruh olduğuna dəlalət etmirsə, bəs necə ola bilər ki, haram olduğunu bildirsin?" İmam Buxari, Təbərani, Davud və ibn Həzm cunublu olan kimsənin Quran oxumasının caiz olduğunu söyləmişlər. Buxari belə demişdir: "İbrahim: "Heyzli qadına Quran oxuduğuna görə günah gəlməz"- demişdir. İbn Abbas cunublu olan kimsənin Quran oxumasını günah hesab etməzdi. Peyğəmbər ﷺ hər zaman Allahı zikr edərdi". İbn Həcər buna aydınlıq gətirib demişdir: "Buxarinin fikrinə görə cunublu və ya heyzli kimsənin Quran oxumasının qadağan ol-

[1] Hədis zəifdir. Təmamul Minnə, 1/115.

masına dair varid olmuş hədislərin heç biri səhih deyildir. Baxmayaraq ki, bu xüsusda rəvayət olunmuş hədislərin hamısını bir araya gətirdikdə, başqalarının fikrinə görə dəlil gətirmək olar. Lakin bu hədislərin çoxu düzgün yozulmamışdır".

**5) Məsciddə oturmaq;** cunub ikən məsciddə oturmaq haramdır. Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ gəldikdə səhabələrin qapıları məscidin həyətinə açılırdı. O: "Evlərinizin qapılarını məsciddən başqa tərəfə çevirin"- dedi. Sonra Peyğəmbər ﷺ içəri keçdi. Səhabələr, bu xüsusda onlara rüsxət veriləcəyinə ümid edərək heç bir iş görmədilər. Peyğəmbər ﷺ bayıra çıxdı və: "Evlərinizin qapılarını məsciddən başqa tərəfə çevirin. Mən, heyzli və ya cunublu olan kimsənin məscidə girməsini halal saymıram"- dedi". Hədisi Əbu Davud rəvayət etmişdir.[1] Ummu Sələmə rəvayət edir ki, Peyğəmbər ﷺ bu məscidin həyətinə girib uca səslə dedi: "Şübhəsiz ki, məscid nə heyz, nə də cunub halında olanlar üçün halal deyildir!" Hədisi ibn Macə və Təbərani rəvayət etmişdir.[2] Hər iki hədis, heyz və ya cunub olan kimsənin məsciddə dayanmasının yaxud oturmasının halal olmadığına dəlalət edir. Lakin aşa-

[1] Hədis zəifdir. Daif Əbu Davud, 232.
[2] Hədis zəifdir. Daif ibn Macə, 645.

ğıdakı ayəyə əsasən heyz və ya cunub olan kimsənin məscidin içindən keçib getməsinə rüsxət verilir. Uca Allah buyurur: **"Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlayana qədər və *cinsi əlaqədən sonra* natəmiz olduğunuz halda, – yolda olan *müsafirlər* istisna olmaqla – qüsl edənədək namaza yaxınlaşmayın".**[1]

Cabir ﷺ rəvayət edir ki, biz cunub olduğumuz halda məscidin içindən keçərdik". Hədisi ibn Əbu Şeybə və Səid ibn Mənsur "Sünən" əsərində rəvayət etmişdir. Zeyd ibn Əsləm rəvayət edir ki, Peyğəmbərin ﷺ səhabələri cunub olduqları halda məscidin içində gəzərdilər". Bu əsəri ibn Munzir rəvayət etmişdir. Yezid ibn Əbu Həbib ﷺ rəvayət edir ki, ənsardan olan bəzi kişilərin qapıları məscidə açılırdı. Cunub olduqları zaman, su gətirmək üçün yalnız məscidin içindən keçib getməli olurdular. Uca Allah da bu ayəni nazil etdi: **"Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlayana qədər və *cinsi əlaqədən sonra* natəmiz olduğunuz halda, – yolda olan *müsafirlər* istisna olmaqla – qüsl edənədək namaza yaxınlaşmayın".**[2] Hədisi ibn Cərir rəvayət etmişdir.[3] Şövkani bu hədisi nəql etdikdən sonra belə demişdir: "Bu hədis özündən sonra heç bir

---

[1] "ən-Nisa" surəsi, 43.
[2] "ən-Nisa" surəsi, 43.
[3] Hədis zəifdir. Təmamul Minnə, 1/119.

şübhə qoymayacaq bir şəkildə cunub ikən məsciddən keçməyin caiz olduğuna dəlalət edir." Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ mənə: "Məsciddəki səccadəni[1] mənə gətir"- deyə buyurdu. Mən: "Heyzliyəm"- dedim. Peyğəmbər buyurdu: "Heyzin ki, sənin əlində deyil". Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Meymunə ﵂ rəvayət edir ki, bizdən birimiz heyz olduqda belə Peyğəmbər ﷺ onun yanına gələr və başını onun qucağına qoyub Quran oxuyardı. Eləcə də bizlərdən biri heyzli ikən onun səccadəsini götürüb məscidə qoyardı". Hədisi Əhməd və Nəsai rəvayət etmişdir. Bu hədisi qüvvətləndirən başqa rəvayətlər də vardır.[2]

## Müstəhəb qüsl

Bu qüslü yerinə yetirən kəs öyülər və savab qazanar; tərk edən kimsə isə nə qınanar, nə də günaha batar. Bunun da aşağıdakı növləri vardır:

**1. Cümə qüslü;** cümə günü, ibadət etmək və namaz qılmaq üçün toplanılan bir gün olduğundan İslam şəriəti qüsl etməyi və müsəlmanların toplandıqları yerdə ən tə-

---

[1] Müsəlmanların namaz qılanda istifadə etdikləri kiçik xalça və ya parçadan tikilmiş döşənək.

[2] Hədis həsəndir. Səhih ən-Nəsai, 385.

miz bir halda olmalırını əmr etmişdir. Əbu Səid əl-Xudri رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "Cümə gününün qüslü həddi-büluğa çatmış hər kəsə vacibdir. Misvakla təmizlənmək, imkan daxilində ətirlənmək də lazımdır". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Burada vacibdir deyildikdə qüslün müstəhəb olduğu qəsd edilir. Buxarinin ibn Ömərdən rəvayət etdiyi hədis buna dəlalət edir: "Ömər ibn Xəttab رضي الله عنه cümə günü minbərdə xütbə verdiyi zaman Peyğəmbərin ﷺ səhabələrindən və ilk mühacirlərdən olan bir kişi içəri girdi. Bu Osman رضي الله عنه idi. Ömər رضي الله عنه onu səsləyib: "Bu nə vaxtın gəlməyidir? "- deyə soruşdu. Osman رضي الله عنه dedi: "Başım işə qarışdı və mən evə gedə bilmədim. Nəhayət azanı eşitdikdə ancaq dəstəmaz ala bildim". Ömər رضي الله عنه dedi: "Ancaq dəstəmaz almısan. Sən ki, Peyğəmbərin ﷺ qüsl almağı əmr etdiyini bilirdin".

Şafii belə demişdir: "Osmanın رضي الله عنه qüsl almaq üçün cümə namazını tərk etməməsi və Ömərin رضي الله عنه ona gedib qüsl etməyi buyurmaması, hədisdə əmr formasında buyurulmuş qüslün müstəhəb olduğuna dəlalət edir. Həmçinin Muslimin *"Səhih" əsərində* Əbu Hureyranın رضي الله عنه Peyğəmbərdən ﷺ rəvayət etdiyi hədis də cümə qüslünün müstəhəb olduğuna dəlalət edir. Bu hədisdə Peyğəmbər ﷺ belə buyurmuşdur: "Hər kim gözəl şəkildə dəstəmaz alsa, sonra

da cümə namazına gəlib *xütbəni* dinləsə və sussa, iki cümə arasında olan günahları, üstəlik üç gün də əlavə olan günahları bağışlanar”. Qurtubi bu hədisi qüslün müstəhəb olduğuna dəlil gətirərək verdiyi izahatda belə demişdir: “Bu hədisdə dəstəmazın və onunla bərabər düzgün şəkildə dəstəmaz alıb cümə namazına gələn kimsənin savab qazanmasının zikr edilməsi, *cümə namazı üçün* dəstəmazın kifayət etdiyini bildirir”. İbn Həcər “Təlxis” əsərində belə demişdir: “Bu hədis *cümə günü* qüsl etməyin vacib olmadığını sübuta yetirən dəlillərin ən tutarlısıdır. Qüslün müstəhəbliyinə dair olan rəy, qüslü tərk etməyin heç bir zərər gətirməyəcəyinə görədir. Hərgah qüslü tərk etməyin hökmü, tər, pis qoxu və buna bənzər şeylərin insanlara əziyyət verəcəyindən asılı olsaydı, qüsl etmək vacib, onu tərk etmək isə haram olardı”. Alimlərin bir qismi Əbu Hureyranın ﵁ rəvayət etdiyi hədisi əsas gətirərək, cümə qüslünün tərk edilməsində insanlara əziyyət olmasa da belə, onun yerinə yetirilməsinin vacib olduğunu demişlər. Onun rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ demişdir: “Müsəlmanın hər yeddi gündə bir dəfə qüsl etməsi, onun üzərinə düşən bir borcdur. Həmin gün o, başını və bədənini yumalıdır”. Hədisi Buxari və Muslim rəvayət etmiş, bu xüsusda varid olan hədisləri zahiri mənasına görə

qəbul etmiş və zidd olan bütün başqa hədisləri inkar etmişlər.

Qüslün vaxtı dan yeri sökülǝndǝn ta cümə namazına qədərdir. Cüməyə gedənə yaxın qüsl almaq isə daha yaxşıdır. Qüsl etdikdən sonra dəstəmaz pozularsa, təkcə dəstəmaz almaq kifayət edər. Əsrəm belə demişdir: “İmam Əhməddən: “Qüsl etdikdən sonra dəstəmazı pozulan kimsənin ancaq dəstəmaz alması kifayətdirmi?”- deyə soruşdular. O: “Bəli, mən bu məsələyə dair ibn Əbzənin hədisindən daha üstün bir rəvayət görmədim”. Bu sözlə imam Əhməd ibn Əbu Şeybənin səhih isnadla Abdurrəhman ibn Əbzədən, onun da səhabə olan atasından rəvayət etdiyi hədisə işarə edir. O, cümə günü qüsl etdikdən sonra dəstəmazı pozulduqda yalnız dəstəmaz alar və təkrar qüsl etməzdi.

Qüslün vaxtı, cümə namazı bitdikdə sona çatır. Deməli, kim cümə namazından sonra qüsl edərsə, cümə üçün qüsl etmiş olmaz və əmri yerinə yetirmiş sayılmaz. İbn Ömərin رضي الله عنهما rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ belə demişdir: “Sizdən biriniz cüməyə gəldikdə, qüsl alsın!” Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Muslimin rəvayətində isə belə demişdir: “Sizdən biriniz cüməyə gəlmək istədikdə, qüsl alsın!” İbn Abdulbərr, cümə namazı üçün qüsl alma-

ğın vacib olduğuna dair bütün alimlərin həmrəy olduğunu nəql etmişdir.

**2. Bayram qüslü;** alimlər bayram günü qüsl etməyin müstəhəb olduğunu söyləmişlər. Lakin qeyd etmək lazımdır ki, bu xüsusda bir dənə də olsun səhih hədis varid olmamışdır. "Bədrul Munir" əsərinin müəllifi belə demişdir: "Bayram qüslünə dair rəvayət olunmuş hədislər zəifdir. Lakin səhabələrdən rəvayət edilmiş bəzi əsərlər mötəbərdir".

**3. Ölünü yuyan adamın qüsl etməsi;** bir çox alimlərin rəyinə görə ölünü yuyan kimsənin qüsl etməsi müstəhəbdir. Əbu Hureyra ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Ölünü yuyan kəs qüsl etsin, onu daşıyan isə dəstəmaz alsın". Hədisi Əhməd, Əbu Davud, Nəsai, Tirmizi, ibn Macə və qeyriləri rəvayət etmişlər.[1] Bəzi imamlar bu hədisin mötəbər olmadığını söyləmişlər. Əli ibn əl-Mədini, Əhməd, ibn Munzir, Rafii və başqaları demişlər ki: "Hədis alimləri bu xüsusda varid olan hədislərdən heç birisini səhih saymamışlar". Lakin ibn Həcər bizim istinad etdiyimiz hədis barədə belə demişdir: "Bu hədisi Tirmizi "həsən", ibn Hibban "səhih" hesab etmişdir." Hədis bir çox isnadlarla rəvayət olunduğundan ən azı "həsən" də-

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 3161.

rəcəsindədir. Tirmizinin hədisi həsən saydığına görə Nəvəvinin ona irad tutmasına isə etiraz olunmuşdur. Zəhəbi demişdir: "Bu hədisin isnadı, fəqihlərin istinad etdiyi bir çox hədislərin isnadlarından daha tutarlıdır". Bu hədisdə əmr formasında buyurulmuş qüsl onun müstəhəb olduğuna dəlalət edir. Ömərin ﵁ rəvayət etdiyi hədis də buna dəlalət edir. O demişdir: "Biz ölü yuyar, sonra da aramızdan bəziləri yuyunar, bəziləri isə yuyunmazdı". Xətib əl-Bəğdadi bu əsəri səhih isnadla rəvayət etmişdir.[1] Əsma bint Umeys ﵂ vəfat etmiş əri Əbu Bəkr əs-Siddiqi yuduqdan sonra bayıra çıxıb orada olan mühacirlərdən soruşdu: "Bu gün hava çox soyuqdur, özüm də oruc tutmuşam. Mənə qüsl etmək vacibdirmi?" Onlar: "Xeyr!"- deyə cavab verdilər". Hədisi Malik rəvayət etmişdir.[2]

**4. Ehrama girmək üçün qüsl etmək;** əksər alimlərin fikrincə, həcc və ya ümrə niyyətilə ehrama girmək istəyən kəsin qüsl etməsi müstəhəbdir. Zeyd ibn Sabit ﵁ rəvayət edir ki, mən, Peyğəmbərin ﷺ ehrama girmək üçün qüsl etdiyini gördüm". Hədisi Daraqutni, Beyhəqi və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədisin həsən olduğunu demiş,[3] Uqeyli isə onu zəif hesab etmişdir.

---

[1] Hədis səhihdir. Təmamul Minnə, 1/121.
[2] Hədis zəifdir. Təmamul Minnə, 1/121.
[3] Hədis həsəndir. İrvaul Ğəlil, 1/178; 149-cu hədis.

**5. Məkkəyə daxil olmaq üçün qüsl etmək;** Məkkəyə daxil olmaq istəyən kimsənin qüsl etməsi müstəhəbdir. İbn Ömər رضي الله عنهما rəvayət edir ki, o Məkkəyə girməzdən əvvəl zi-Tuvadan keçər, səhərədək orada gecələyər, səhər açıldıqda *qüsl edib* Məkkəyə daxil olardı". O, Peyğəmbərin də ﷺ belə etdiyini söyləyərdi". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Bu, Muslimin rəvayətidir. İbn Munzir demişdir: "Alimlərin hamısının rəyinə görə Məkkəyə daxil olduqda qüsl almaq müstəhəbdir. Onların fikrincə Məkkəyə daxil olarkən qüslü etməməyə görə fidyə vermək lazım gəlmir. Bir qismi isə dəstəmaz almağın yetərli olduğunu söyləmişlər".

**6. Ərafatda dayanmaq üçün qüsl etmək;** həcc ziyarəti əsnasında Ərəfatda dayanmaq istəyən kimsənin qüsl etməsi müstəhəbdir. Malik Nafidən rəvayət edir ki, Abdullah ibn Ömər رضي الله عنهما ehrama girməzdən əvvəl – ehram üçün, Məkkəyə daxil olmaq üçün və Ərəfatda dayanmaq üçün qüsl edərdi".

## Qüslün ərkanları

Şəriət qanununa görə qüsl yalnız iki əsası yerinə yetirməklə tam sayıla bilər:

**1. Niyyət etmək;** çünki o, ibadəti adətdən ayırır. Niyyət sırf qəlbə aid olan bir əməldir. İnsanların bir çoxunun

niyyəti dil ilə tələffüz etməyi adət halına salması isə sonradan uydurulan və şəriət qayda-qanunlarına zidd olan şeylərdir. Bunu tərk etmək və bunun qarşısını almaq vacibdir. Artıq "dəstəmazda niyyət" fəslində bu xüsusda məlumat verilmişdir.

**2. Bütün əzaları yumaq;** Uca Allah buyurur: ***"Yaxınlıq edib* natəmiz olmuşsunuzsa, qüsl edin".**[1] **"Səndən heyz barəsində soruşurlar. De: "Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlarla *yaxınlıq etməkdən* uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin".**[2] Burada pak olmaq deyildikdə qüsl etmək qəsd edilir. Buna da Uca Allahın bu ayəsi dəlalət edir: **"Ey iman gətirənlər! Sərxoş ikən nə dediyinizi anlayana qədər və *cinsi əlaqədən sonra* natəmiz olduğunuz halda, – yolda olan *müsafirlər* istisna olmaqla – qüsl edənədək namaza yaxınlaşmayın".**[3] Qüsl etmək – bütün əzaları yumaq deməkdir.

## Qüslün sünnələri

Qüsl edən kimsənin, Peyğəmbərin ﷺ qüsl alarkən etdiyi əməllərə riayət etməsi sünnədir:

---

[1] "əl-Maidə" surəsi, 6.
[2] "əl-Bəqərə" surəsi, 222.
[3] "ən-Nisa" surəsi, 43.

Əvvəlcə əllərini üç dəfə yumalı; sonra övrət yerini yumalı; sonra namaz üçün dəstəmaz aldığı kimi dəstəmaz almalı. Əgər ləyən və ya buna bənzər şeyin içində qüsl edirsə, ayaqlarını axırda yuya bilər; sonra üç dəfə başına su tökməli və əllərini saçlarının arasına salıb suyu saçların dibinə çatdırmalı; sonra vücudun hər yerinə - əvvəlcə sağ, sonra da sol tərəfinə su töküb qoltuqların altını, qulaqların içini, göbəyi, ayaq barmaqların arasını və bədəndə ovxalanması mümkün olan yerləri ovxalamaqla bədəni yumaq. Bütün bunlar Aişədən ﵂ belə rəvayət edilmişdir: "Peyğəmbər ﷺ cunub ikən qüsl etdikdə əvvəlcə əllərini yuyar, sonra sağ əli ilə sol əlinin üzərinə su tökərək övrət yerlərini yuyar, sonra da namaz qılmaq üçün dəstəmaz aldığı kimi dəstəmaz alardı. Sonra ovucuna su alıb başına tökər və əllərini saçlarının arasına salıb suyu saçların dibinə çatdırardı. Beləcə o, başına üç ovuc su tökərdi. Sonra da bədənin qalan yerlərini yuyardı". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Buxari və Muslimin rəvayət etdiyi digər hədisdə belə deyilir: "... sonra o, əllərini saçlarının arasına salıb onları ovxalayar, barmaqlarının dəriyə dəydiyini hiss etdikdən sonra üstünə üç dəfə su tökərdi". Yenə onların rəvayətində Aişə ﵂ demişdir: "Peyğəmbər ﷺ cunub ikən qüsl etdikdə bir qab su gətizdirər, ovucu ilə su götürüb əvvəlcə başının sağ tərəfini, sonra sol tərəfini

yuyar, sonra da ovuclarını su ilə doldurub başına tökərdi". Meymunə رضي الله عنها rəvayət edir ki, mən Peyğəmbərin ﷺ qüsl etməsi üçün su hazırladım. Peyğəmbər ﷺ əllərinə su töküb onları iki və ya üç dəfə yudu; sonra sağ əli ilə sol əlinin üzərinə su tökərək övrət yerlərini yudu; sonra əllərini yerə sürtdü; sonra ağzını və burnunu yaxaladı, üzünü və qollarını yudu; sonra üç dəfə başını yudu və bədəninə su tökdü; sonra dayandığı yerdən kənara çəkilib ayaqlarını yudu. Mən Peyğəmbərin ﷺ silinməsi üçün bir bez parça gətirdim. Lakin o, parçanı götürməyib qollarındakı suyu əli ilə silməyə başladı". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

## Qadının qüsl alması

Qadının qüsl etməsi kişinin qüsl etməsi kimidir. Lakin əgər qadının saçlarının dibinə su çatırsa, onda ona hörüklərini açmaq vacib deyil. Ummu Sələmə رضي الله عنها rəvayət edir ki, bir qadın dedi: "Ya Rəsulullah! Mən saçları çox sıx hörülmüş bir qadınam. Cənabət qüslünü etdikdə onları açımmı?" Peyğəmbər ﷺ buyurdu: "Sənə, üç ovuc su götürüb başına tökmək kifayətdir. Sonra bədəninin başqa yerlərinə də su tök. Beləliklə də sən təmizlənərsən". Hədisi Əhməd, Muslim və Tirmizi rəvayət etmişdir. Tirmizi hədi-

sin həsən-səhih olduğunu demişdir. Ubeyd ibn Umeyr demişdir: "Aişəyə xəbər çatdı ki, Abdullah ibn Amr qadınlara qüsl etdikləri zaman hörüklərini açmalarını əmr edir. Aişə dedi: "Əcəb (adamdır) bu Amrın oğlu! Qadınlara qüsl etdikləri zaman hörüklərini açmalarını əmr edir. Niyə onlara başlarını keçəl qırxdırmağı əmr etmir?![1] Düzünə qalsa, mən Peyğəmbərlə ﷺ birlikdə bir qabdan (su götürüb) qüsl edərdim. Mən başıma üç kərə su tökməkdən əlavə bir şey etməzdim". Hədisi Əhməd və Muslim rəvayət etmişdir. Qadına, heyz və ya nifas qanı kəsildikdən sonra qüsl etdikdə pambıq və ya buna bənzər bir şeyi ətirləyib övrət yerinə sürtməsi müstəhəbdir. Beləcə, murdar qanın iyisini yox etmiş olar. Aişə رضي الله عنها rəvayət edir ki, Əsma bint Yezid Peyğəmbərdən ﷺ heyzdən sonrakı qüsl barəsində soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Sizdən biriniz (heyzdən təmizləndiyi zaman) suyunu və sidrini[2] götürüb təmizlənsin. Təmizlənməyi də gözəl şəkildə yerinə yetirsin. Sonra başına su töksün və su onun saç köklərinə çatana kimi başını yaxşıca ovxalasın. Sonra bədəninə su əndərsin. Son-

---

[1] Aişə رضي الله عنها demək istəyir ki, əgər qadına hər qüsl etdikdə hörüklərini açmaq vacibdirsə, onda ona bu məşəqqətdən qurtarmaq üçün başını qırxdırmaq daha əlverişlidir. Bu söz bir kinayədir. Yoxsa qadına başını qırxdırmaq haram buyurulmuşdur.

[2] Şam fəsiləsindən həmişəyaşıl, iynəyarpaqlı ağacdır. Hədisdə "sidrini" deyildikdə həmin ağacın yarpaqları nəzərdə tutulur ("əl-Movsua əl-Fiqhiyyə", 313/18).

ra da ətirlənmiş bir parça götürüb onunla təmizlənsin". Əsma: "Onunla necə təmizlənsin?"– deyə soruşdu. (Peyğəmbər ﷺ) buyurdu: "Subhənallah! Onunla təmizlənirsən!" Aişə (oradakılara eşitdirməsin deyə) alçaq səslə (qadına): "Qan ləkəsi qalmış yerləri silib təmizlə"– dedi. (Sonra) qadın Peyğəmbərdən ﷺ cənabət qüslü barədə soruşdu. Peyğəmbər ﷺ buyurdu: "Su götürüb təmizlənsin və təmizlənməni gözəl şəkildə, yaxud tamam-kamal yerinə yetirsin. Sonra başına su töksün və (su) onun saç köklərinə çatana kimi başını ovxalasın. Sonra da bədəninə su əndərsin". Aişə dedi: "Ənsar qadınları nə gözəl qadınlardır! Həyaları onlara dini öyrənməyə mane olmamışdır". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir.[1]

## Qüsl ilə əlaqəli bəzi məsələlər

**1.** Heyz və cunub halına görə, yaxud cümə və bayrama görə, və ya cunub və cüməyə görə iki niyyətlə bir qüsl etmək kifayətdir. Çünki Peyğəmbər ﷺ belə buyurmuşdur: "Hər kəsə yalnız niyyət etdiyi şey qalacaqdır..."

---

[1] Hədisi Muslim, Əbu Davud, ibn Macə və Əhməd (6/147-148) rəvayət etmişdir. Buxari və Nəsai isə bu hədisdəki cənabət qüslü barəsində sual istisna olmaqla hədisin yalnız əvvəlini rəvayət etmişdir. Təmamul Minnə, 1/124.

**2.** Cunub olan kəs qüsl etdikdə dəstəmaz almayıbsa, onun qüslü dəstəmazı əvəz edir. Aişə ﵂ rəvayət edir ki, Peyğəmbər ﷺ qüsl etdikdən sonra dəstəmaz almazdı".[1] İbn Ömər ﵄: "Mən qüsldən sonra dəstəmaz alıram"**-** deyən adama: "Sən çox dərinə gedirsən (vaxtını bihudə işə sərf edirsən)"- demişdir".[2] Əbu Bəkr ibn əl-Ərəbi demişdir: "Alimlər dəstəmazın qüslün daxilində olduğuna dair ixtilaf etməmişlər." Cunub ikən niyyət edib qüsl etmək dəstəmazı da əvəz edir. Çünki cunub halında yerinə yetirilməsi qadağan edilən əməllər, dəstəmaz halında yerinə yetirilməsi qadağan edilən əməllərdən çoxdur. Və bir qayda olaraq az olan, çox olan üçün edilmiş niyyətə daxildir. Odur ki, böyük olan üçün niyyət etmək, kiçik olanı əvəz edir.

**3.** Cunub və heyz halında olan kimsənin saçlarını kəsməsi, dırnaqlarını tutması, bazarda gəzib-dolaşması və başqa buna bənzər işlər görməsi caizdir. Əta *ibn Əbu Rəbah* demişdir: "Cunub olan kimsənin, – dəstəmaz almasa da belə, qan aldırması, dırnaqlarını tutması və başını qırxdırması caizdir." Bu əsəri Buxari rəvayət etmişdir.

**4.** Hamama gedən kəs, başqasının övrət yerlərini görməyəcəyinə və ya başqalarının onun övrət yerini görməyəcəklərinə əmin olacağı təqdirdə hamama gedə bilər.

---

[1] Hədis səhihdir. Mişkatul Məsabih, 1/96.

[2] Müsənnəf ibn Əbu Şeybə, 1/88; Müsənnəf Abdurrəzzaq, 1041-ci hədis.

Əhməd demişdir: “Əgər hamamdakıların hamısının fitə bağladığını bilirsənsə, hamama gir; yoxsa ora girmə.” Peyğəmbər ﷺ belə buyurmuşdur: “Kişi kişinin övrət yerinə baxmamalı, habelə qadın da qadının övrət yerinə baxmamalıdır!”[1] Hamamda Allahı zikr etməkdə heç bir günah yoxdur. Mane ola biləcək bir hökm varid olmayınca Allahı hər bir halda yad etmək savabdır. Peyğəmbər ﷺ hər cür vəziyyətdə Allahı zikr edərdi.[2]

**5.** İstər yay, istərsə də qış olsun, qüsl və dəstəmaz aldıqdan sonra əzaları dəsmal və buna bənzər şeylərlə qurulamaq caizdir.

**6.** Qadın və kişinin bir qabdan su götürüb qüsl etməsi caiz olduğu kimi, kişinin qadının yuyunduğu sudan artıq qalmış su ilə yuyunması, həmçinin qadının da kişinin yuyunduğu sudan artıq qalmış su ilə yuyunması caizdir. İbn Abbas رضي الله عنهما rəvayət edir ki, Peyğəmbərin ﷺ zövcələrindən birisi bir qabdan su götürüb yuyundu. Peyğəmbər ﷺ gəlib dəstəmaz və ya qüsl almaq istədikdə qadını ona: “Ya Rəsulallah! Mən cunub idim”- dedi. Peyğəmbər ﷺ: “Su, cunub olmaz!”- deyə buyurdu. Hədisi Əhməd, Əbu Davud, Nəsai və Tirmizi rəvayət etmişdir. Tirmizi bu hədi-

---

[1] [Hədisi Muslim rəvayət etmişdir.]

[2] [Aişədən رضي الله عنها rəvayət olunan bu hədisi Muslim və başqaları rəvayət etmişdir.]

sin həsən-səhih olduğunu demişdir.[1] Aişə رضي الله عنها Peyğəmbərlə ﷺ bərabər bir qabdan su götürüb qüsl edər, biri digərindən əvvəl su götürər, hətta Peyğəmbər ﷺ ona "Mənə də su saxla", o da Peyğəmbərə ﷺ: "Mənə də su saxla"- deyərdi.[2]

**7.** Camaat arasında lüt-üryan çimmək caiz deyil. Çünki ayıb yerlərini açmaq haramdır. Lakin pərdə çəkib qüsl etmək olar. Belə ki, Fatimə رضي الله عنها pərdə tutar və Peyğəmbər ﷺ qüsl edərdi. Həmçinin insanların gözündən uzaq bir yerdə lüt çimməyin də heç bir eybi yoxdur. Buxarinin rəvayət etdiyi hədisdə Musanın عليه السلام lüt-üryan çimdiyi xəbər verilmişdir. Əbu Hureyra رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Əyyub çılpaq çimərkən onun üstünə qızıldan çəyirtkələr töküldü. Əyyub (onları) paltarının (cibinə) yığmağa başladı. (Bu vaxt) Uca və Ulu Rəbbi onu çağırıb: "Ey Əyyub! Məgər Mən səni bu gördüyündən (də artığı ilə) zəngin etmədimmi?"– deyə buyurdu. Əyyub: "Bəli, Sənin izzətinə and olsun ki, (elədir). Lakin mən (hər zaman) Sənin bərəkətinə möhtacam"– deyə cavab verdi. Hədisi Əhməd, Buxari və Nəsai rəvayət etmişdir.

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 68.

[2] [Hədisi Muslim, Nəsai və başqaları rəvayət etmişdir.]

# Təyəmmüm

**1. Tərifi;** təyəmmümün lüğəti mənası “yönəlmək” deməkdir. İstilahi mənada isə bu, namaz və buna bənzər ibadətlərin caiz olması niyyəti ilə üzü və əlləri məsh etmək üçün əlləri təmiz torpağa vurmaqdır.

**2. Şəriət qanunu olduğuna dair dəlillər;** təyəmmümün şəriət qanununa aid olduğu Quran, Sünnə və icma (yəni alimlərin yekdil rəyi) ilə sübuta yetirilmişdir.

Quranda uca Allah buyurur: **“Əgər xəstə və ya səfərdə olsanız, yaxud sizlərdən biri ayaq yolundan gəlibsə və ya qadınlarla yaxınlıq etmisinizsə, su tapmasanız, təmiz torpaqla təyəmmüm edin, üzünüzə və əllərinizə sürtün! Həqiqətən, Allah əfv edəndir, Bağışlayandır”.**[1]

Sünnəyə gəlincə, Əbu Umamə ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə demişdir: “Yer üzünün hər tərəfi mənim və ümmətim üçün həm namazgah, həm də pak edildi. Ümmətimdən kim namaz vaxtına yetişsə, *bilsin ki,* təmizləyicisi yanındadır”. Hədisi Əhməd rəvayət etmişdir.[2]

İcmaya gəldikdə isə, demək olar ki, müsəlmanların hamısı təyəmmümün şəriət qanunu olduğunu, xüsusi hallarda dəstəmazı və qüslü əvəz etdiyini demişlər.

---

[1] “ən-Nisa” surəsi, 43.

[2] Hədis səhihdir. İrvaul Ğəlil, 152-ci hədis.

**3. Təyəmmümün ancaq müsəlman ümmətinə məxsus olması;** təyəmmüm Allahın bu ümmətə verdiyi xüsusiyyətlərdən biridir. Cabir ibn Abdullah ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ demişdir: "Mənə beş (xislət) verilib ki, bunlar məndən əvvəl heç bir kəsə verilməmişdir: "Bir ay əvvəl düşmənin qəlbinə qorxu salaraq ona qalib gəlməyim; yer üzünün mənim üçün pak və namazgah olması, belə ki, ümmətimdən olan hər bir kəs istənilən yerdə vaxtı girmiş namazı qılmalıdır; qənimətlərin mənə halal olması, belə ki, bu, məndən qabaq heç bir peyğəmbərə halal olmamışdır; (Qiyamət günü tərifəlayiq məqamda) şəfaət verməyim; və bir də hər bir peyğəmbər yalnız öz qövmünə göndərilərdi, mən isə bütün insanlara göndərilmişəm." (əl-Buxari, 335). Hədisi Buxari və Muslim rəvayət etmişdir.

**4. Təyəmmümün qanunilәşməsinin səbəbi;** Aişə ﵂ demişdir: "Biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxdıq. Nəhayət, Beyda və ya Zətul Ceyş deyilən yerə çatdıqda boyunbağım qırılıb yerə düşdü. (Boyunbağım) axtarılıb-tapılsın deyə Peyğəmbər ﷺ o yerdə dayandı. Camaat da onunla bərabər dayandı. Ətrafda su yox idi. Habelə onların yanlarında da su yox idi. Elə buna görə də camaat Əbu Bəkrin yanına gəlib dedi: "Aişənin nə etdiyini görürsənmi?! Allahın elçisini və bu qədər camaatı yoldan eləyib. Onlar su olmayan yerdə dayanıblar, özlərinin də su ehtiyatı qur-

tarıb". Əbu Bəkr (mənim yanıma) gəldi. Bu vaxt Peyğəmbər ﷺ başını dizimin üstünə qoyub yatmışdı. Əbu Bəkr dedi: "Allahın elçisini və bu qədər camaatı su olmayan bir yerdə, həm də su ehtiyatları olmadığı halda saxlamısan?!" Sonra Aişə dedi: "Əbu Bəkr məni danladı, xeyli söyləndi və barmağı ilə böyrümdən vurmağa başladı. Bu vaxt Peyğəmbərin ﷺ başı dizimin üstündə olduğuna görə mən tərpənmədim. Peyğəmbər ﷺ (elə oradaca) yatdı. Nəhayət, səhər açıldıqda o, (dəstəmaz almaq üçün) su tapmadı. (Elə bu səbəbdən də) Uca Allah təyəmmüm ayəsini nazil etdi və onlar təyəmmüm etdilər.

(Nümayəndələrdən biri) – Useyd ibn Hudeyr dedi: "Ey Əbu Bəkrin ailəsi! Bu sizin ilk bərəkətiniz deyildir".

Aişə dedi: "Sonra üstündə oturduğum dəvəni qaldırdıq və boyunbağını onun altından tapdıq". Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir.

**5. Aşağıdakı səbəblərdən dolayı təyəmmüm etmək olar;** aşağıdakı səbəblərdən biri olduğu təqdirdə dəstəmazı olmayan və ya cunub halında olan kimsəyə həm səfərdə, həm də evində olarkən təyəmmüm etməyə izn verilir:

a) Su tapmadıqda və ya tapdığı su təmizlənmək üçün yetərli olmadıqda təyəmmüm edə bilər; İmran ibn Huseyn ؓ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxmışdıq. O, camaata namaz qıldırdı. Namazı bitirdikdən

sonra bir nəfərin kənara çəkilib camaatla namaz qılmadığını gördü və: "Sənə camaatla namaz qılmağa nə mane oldu, ey filankəs?"– deyə soruşdu. O: "Mən cunub oldum; su da yoxdur"– deyə cavab verdi. Peyğəmbər ﷺ (ona): "Torpaqdan istifadə et! Bu sənə kifayət edər"– dedi". Hədisi Buxari və Muslim rəvayət etmişdir. Əbu Zərr رضي الله عنه rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "On il su tapmayan kimsəyə torpaq təmizləyici olaraq bəs edər". Hədisi Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Tirmizi demişdir: "Bu hədis həsən-səhihdir".[1] Lakin təyəmmüm etməzdən əvvəl özünün su axtarması, yaxud yoldaşlarından və ya yaxın yerdə olanlardan su istəməsi vacibdir. Yox əgər su tapılmayacağına və ya onun çox uzaq yerdə olduğuna əmindirsə, onda onu axtarmaq gərək deyil.

b) Əgər bədənində yara varsa və ya canı xəstədirsə, üstəlik sudan istifadə edəciyi təqdirdə xəstəliyinin artacağından yaxud gec sağalacağından qorxursa, təyəmmüm edə bilər. Xəstəliyinin artacağını və ya gec sağalacağını isə keçmiş təcrübəyə yaxud inanılmış həkimlərin qoyduğu müayinəyə görə təyin edə bilər. Cabir رضي الله عنه rəvayət edir ki, biz səfərdə ikən birimizin başına daş düşdü və onun başı

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 322.

yarıldı. Sonra cunub oldu və dostlarından: "Mənim üçün təyəmmüm etməyə rüsxət varmı?"- deyə soruşdu. Dostları ona: "Sənin üçün heç bir rüsxət ola bilməz. Çünki sən sudan istifadə edə bilərsən"- dedilər. O, qüsl etdi və öldü. Biz Peyğəmbərin ﷺ yanına gəldikdə bu haqda ona xəbər verdik. Peyğəmbər ﷺ dedi: "Allah onları qəhr etsin! Onu onlar öldürdülər. Bilmədiklərini soruşa bilməzdilərmi? Şübhəsiz ki, cahilliyin əlacı soruşmaqdır. Ona, təyəmmüm etmək və yarasını sarğı ilə bağlayıb üstünə məsh çəkmək, sonra da bədənin başqa yerlərini yumaq kifayət edərdi". Hədisi Əbu Davud, ibn Macə və Daraqutni rəvayət etmişdir. İbn Səkən bu hədisi səhih hesab etmişdir.[1]

c) Su çox soyuq olduğu halda ondan istifadə edəcəyi təqdirdə zərər çəkəcəyini güman edərsə, üstəlik pul verib suyu isitmək və ya hamama girmək mümkün deyilsə, onda təyəmmüm edə bilər; Amr ibn As رضي الله عنه zatu-Səlasil döyüşündə *başına gələni* belə rəvayət etmişdir: "Şaxtalı bir gecədə mən cunub oldum. Qüsl edəcəyim təqdirdə öləcəyimdən qorxdum. Elə buna görə də təyəmmüm etdim, sonra da dostlarımla birgə sübh namazını qıldım. Biz Peyğəmbərin ﷺ yanına gəldikdə onlar bu haqda Peyğəmbərə ﷺ

---

[1] Hədisin: "Ona, təyəmmüm etmək və yarasını sarğı ilə bağlayıb üstünə məsh çəkmək, sonra da bədənin başqa yerlərini yumaq kifayət edərdi" tərəfi istisna olmaqla yerdə qalan hissəsi "həsən"dir. Səhih Əbu Davud, 336.

xəbər verdilər. O dedi: "Ey Amr! Sən cunub olduğun halda dostlarınla namaz qılmısan?" Dedim: "Mən qüdrətli və qüvvətli Allahın: **"özünüz özünüzü öldürməyin. Həqiqətən, Allah sizə qarşı Rəhmlidir"**[1] ayəsini xatırladıqdan sonra təyəmmüm edib namaz qıldım". Peyğəmbər ﷺ güldü və heç nə demədi". Hədisi Əhməd, Əbu Davud, Hakim, Daraqutni, ibn Hibban, habelə Buxari "müəlləq" isnadla rəvayət etmişdir.[2] Peyğəmbər ﷺ bu hərəkəti ilə səhabənin düzgün mövqe tutduğunu təsdiq etmişdir. Təsdiqləməyin özü də bir dəlildir. Çünki Peyğəmbər ﷺ heç vaxt batil bir şeyi təsdiqləməzdi.

d) Əgər su yaxında ikən, özünə, malına və namusuna bir zərər toxunacağından, yaxud yoldaşlarının *onu qoyub* gedəcəklərindən ehtiyat etsə, yaxud onunla suyun arasında insan və ya başqa bir qorxulu düşmən varsa, yaxud həbs edilmişdirsə, yaxud ip və vedrə kimi su çıxartmaq üçün istifadə edilən alətlər olmadığından su əldə etməyə aciz qalarsa, təyəmmüm edə bilər. Çünki belə bir halda suyun mövcudluğu onun yoxluğu kimidir. Həmçinin etmədiyi bir işə görə ittiham olunacağından, beləliklə də əziyyət çəkəcəyindən qorxsa, təyəmmüm edə bilər.

---

[1] "ən-Nisa" surəsi, 29.

[2] Hədis səhihdir. Səhih Əbu Davud, 343.

h) Özünün və ya başqasının, hətta əhliləşdirilmiş itin belə içməsi üçün, yaxud xəmir yoğurmaq, yemək bişirmək və təmizlənməsi zəruri olan nəcasəti təmizləmək üçün qalan sudan artıq su yoxdursa, onda o suyu saxlayıb təyəmmüm edə bilər. İmam Əhməd ibn Hənbəl demişdir ki: "Səhabələrdən bir çoxları təyəmmüm edər, içmək üçün olan suyu saxlayardılar". Əli ibn Əbu Talib ﷺ demişdir: "Səfərdə cunub olan adam götürdüyü su ilə qüsl edəcəyi təqdirdə susuz qalacağından qorxarsa, yuyunmayıb təyəmmüm etsin". Bu əsəri Daraqutni rəvayət etmişdir. İbn Teymiyyə demişdir: "Su tapmadığına görə özünü saxlayıb təbii ehtiyacını rəf etməyən kimsənin, sıxıla-sıxıla namaz qılmasındansa, dəstəmazını pozub təyəmmümlə namaz qılması daha əfzəldir".

e) Sudan istifadə etməyə qadir olduğu halda dəstəmaz və ya qüsl aldığı təqdirdə vaxtın çıxacağından qorxarsa, təyəmmüm edib namazını qıla bilər. Belə olduğu halda namazı təkrar qılmağa gərək yoxdur.[1]

**6. Təyəmmüm edilən torpaq;** təyəmmümü təmiz torpaqla və hər torpaq cinsindən olan qum, daş və qips

[1] Su ola-ola səbəbsiz yerə təyəmmüm almaq şəriətə müxalifdir və bu cür qılınan namaz batildir. Ona ğörə də hətta namazın vaxtı çıxırsa da qüsl və ya dəstəmaz əvəzinə təyəmmüm etmək olmaz. (Su ilə qüsl və ya dəstəmaz alıb sonra namaz qılınmalıdır.) Təmamul-Minnə, 1/132.

kimi şeylərlə etmək olar. Uca Allah buyurur: **“təmiz torpaqla təyəmmüm edin”.**[1] Dilçi alimlər ittifaq etmişlər ki, bu ayədə **“said”** deyildikdə, – istər torpaq, istərsə də başqa bir şey olsun, – yer üzü qəsd edilir.

**7. Təyəmmüm etməyin qaydası;** təyəmmüm edən kəs öncə niyyət etməlidir.[2] *Niyyət barəsində isə artıq dəstəmaz fəslində bəhs edilmişdir*. Sonra bismilləh deyib ovuclarının içini təyəmmüm üçün seçilmiş yerə *bir dəfə* vurmalı, sonra da əllərini üzünə çəkməli və biləyə qədər bir-birinə sürtməlidir. Bu xüsusda varid olan ən mötəbər hədis Ammarın ﵁ rəvayət etdiyi hədisdir. Ammar ﵁ rəvayət edir ki, mən cunub oldum və *qüsl etmək üçün* su tapa bilmədim. Odur ki, yerə uzanıb o üz-bu üzə çevrilərək bədənimi torpağa sürtdüm, sonra da namazımı qıldım. Mən bunu Peyğəmbərə ﷺ xəbər verdikdə o: “Sənə belə etmək kifayət edərdi”– deyib əllərini yerə vurdu, sonra əllərinin içinə üfürdü, sonra da ovuclarını üzünə və biləyə qədər *əllərinə* sürtdü. Hədisi Buxari və Muslim rəvayət etmişdir. Digər rəvayətdə belə buyurmuşdur: “Sənə, əllərini torpağa vurmaq, sonra ovuclarının içinə üfürmək, sonra da əllərini üzünə çəkmək və biləyə qədər bir-birinə sürtmək bəs edərdi”. Hədisi Daraqutni rəvayət etmişdir. Bu hədis,

---

[1] “əl-Maidə” surəsi, 6.

[2] Bunu etmək vacibdir.

*təyəmmüm etdikdə* əlləri yalnız bir dəfə torpağa vurmağa və onları ancaq biləklərə qədər bir-birinə sürtməyə dəlalət edir. Həmçinin torpaqla təyəmmüm edən kimsənin, əllərinə üfləyib torpağı təmizləməsinin və sir-sifətini toz-torpağa bulaşdırmamasının Sünnə olduğunu göstərir.

**8. Təyəmmümlə yerinə yetirilməsi mübah[1] sayılan əməllər;** su tapılmadıqda təyəmmüm etmək həm dəstəmazı, həm də qüslü əvəz edir deyə dəstəmaz və ya qüsl etməklə mübah olan hər şey təyəmmümlə də edilməsi mübah sayılır. Təyəmmümün səhih sayılması üçün vaxtın girməsi şərt deyildir. Belə ki, təyəmmüm edən kəs bir təyəmmümlə istədiyi qədər vacib və nafilə namazlarını qıla bilər. Təyəmmümün hökmü dəztəmazın hökmü kimidir; tamamilə eynidir. Əbu Zərr ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ belə buyurmuşdur: "On il su tapmayan kimsəyə torpaq təmizləyici olaraq bəs edər. Su tapdığı zaman bədəninə su vursun. Bu onun üçün daha xeyirlidir". Hədisi Əhməd və Tirmizi rəvayət etmişdir. Tirmizi hədisin səhih olduğunu demişdir.[2]

**9. Təyəmmümü pozan amillər;** dəstəmazı pozan amillər təyəmmümü də pozur. Çünki təyəmmüm dəstəmazı əvəz edir. Bundan əlavə suyun tapılması və ya sudan isti-

---

[1] Edilməsi və ya edilməməsi könüllü, ixtiyari olan şeylər mübah sayılır.
[2] Hədis səhihdir. Səhih Əbu Davud, 322.

fadə etməyin mümkün olması da təyəmmümü pozur. Lakin əgər namazı təyəmmümlə qıldıqdan sonra su taparsa və ya sudan istifadə etməyə imkanı çatarsa, vaxt qalmış olsa belə namazı təkrar qılmaq ona vacib olmaz. Əbu Səid əl-Xudri ﷺ rəvayət edir ki, iki kişi səfərə çıxdı. Namazın vaxtı yetişdikdə yanlarında su yox idi. Odur ki, təmiz torpaqla təyəmmüm edib namaz qıldılar. Sonra namazın vaxtı çıxmazdan əvvəl su tapdılar. Onlardan biri dəstəmaz alıb namazı təkrar qıldı. Digəri isə onu təkrarlamadı. Sonra Peyğəmbərin ﷺ yanına gəlib bunu ona xəbər verdilər. Peyğəmbər ﷺ namazını təkrar qılmayana: "Sən Sünnəyə uyğun hərəkət etdin və qıldığın namaz sənə kifayətdir"- dedi; dəstəmaz alıb namazını yenidən qılana isə: "Sən ikiqat savab qazandın"- dedi. Hədisi Əbu Davud və Nəsai[1] rəvayət etmişdir. Lakin əgər namaz əsnasında su tapılarsa və ya sudan istifadə etməyə imkan yaranarsa, təyəmmüm pozular və su ilə yuyunmaq ona vacib olar. Yuxarıda, Əbu Zərdən ﷺ rəvayət edilən hədis buna dəlildir. Bu hədisdə Peyğəmbər ﷺ belə demişdir: "..Su tapdığı zaman bədəninə su vursun.." Əgər cunub halında olan kəs və ya heyzdən təmizlənmiş qadın mübah sayılan səbəbdən dolayı təyəmmüm etmişdirsə, onun namazı təkrar qılmasına

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 327.

lüzum yoxdur. Sadəcə olaraq sudan istifadə etməyə qadir olduğu zaman qüsl etməlidir. İmran ibn Huseyn ﷺ rəvayət edir ki, biz Peyğəmbərlə ﷺ birlikdə səfərə çıxmışdıq. O, camaata namaz qıldırdı. Namazı bitirdikdən sonra bir nəfərin kənara çəkilib camaatla namaz qılmadığını gördü və: "Sənə camaatla namaz qılmağa nə mane oldu, ey filankəs?"– deyə soruşdu. O: "Mən cunub oldum; su da yoxdur"– deyə cavab verdi. Peyğəmbər ﷺ (ona): "Torpaqdan istifadə et! Bu sənə kifayət edər"– dedi". İmran ﷺ rəvayətinə davam edib dedi: "Onlar su tapdıqdan sonra Peyğəmbər ﷺ cunub olan kimsəyə bir qab su verdi və: "Get bunu üstünə tök"– dedi". Hədisi Buxari rəvayət etmişdir.

## Sarğı və buna bənzər şeylərin üzərinə məsh çəkmək

**1. Sarğı və buna bənzər şeylərin üzərinə məsh çəkməyin şəriət qanunundan olması;** yara olan əzaları sarımaq üçün istifadə edilən sarğı və buna bənzər şeylərin üzərinə məsh etmək şəriət qanununa aiddir. Bu xüsusda bir çox hədislər varid olmuşdur. Həmin hədislər nə qədər zəif olsa da, onların müxtəlif isnadlarla rəvayət edilməsi hədisin etibarını artırır və dəlil-sübut üçün yararlı olduğunu göstərir. Cabir ﷺ rəvayət edir ki, bir kişinin başına

daş düşdü və onun başı yarıldı. Sonra cunub oldu və dostlarından: "Mənim üçün təyəmmüm etməyə rüsxət varmı?"- deyə soruşdu. Dostları ona: "Sənin üçün heç bir rüsxət ola bilməz. Çünki sən sudan istifadə edə bilərsən"- dedilər. O, qüsl etdi və öldü. Biz Peyğəmbərin ﷺ yanına gəldikdə bu haqda ona xəbər verdik. Peyğəmbər ﷺ dedi: "Allah onları qəhr etsin! Onu onlar öldürdülər. Bilmədiklərini soruşa bilməzdilərmi? Şübhəsiz ki, cahilliyin əlacı soruşmaqdır. Ona, təyəmmüm etmək və yarasını sarğı ilə bağlayıb üstünə məsh çəkmək, sonra da bədənin başqa yerlərini yumaq kifayət edərdi". Hədisi Əbu Davud, ibn Macə və Daraqutni rəvayət etmişdir. İbn Səkən bu hədisi səhih hesab etmişdir.[1] İbn Ömərin رضي الله عنهما sarğı üzərinə məsh etdiyi də rəvayət olunmuşdur.

**2. Məshin hökmü;** istər dəstəmaz aldıqda, istərsə də qüsl etdikdə yara olan əzanı yumaq və ya onun üzərinə məsh etmək əvəzinə onu sarğı ilə bağlayıb sarğının üzərinə məsh çəkmək vacibdir.

**3. Məsh nə zaman vacib olur?** Bədənində yara və ya sınıq olan kəs dəstəmaz yaxud qüsl almaq istədikdə əzalarını yumalıdır. Hətta bundan ötrü su qızdırmaq lazım

---

[1] Hədisin: "Ona, təyəmmüm etmək və yarasını sarğı ilə bağlayıb üstünə məsh çəkmək, sonra da bədənin başqa yerlərini yumaq kifayət edərdi" tərəfi istisna olmaqla yerdə qalan hissəsi "həsən"dir. Səhih Əbu Davud, 336.

gələrsə belə su qızdırıb əzalarını yumalıdır. Əgər əzanı yuyacağı təqdirdə xəstəlik əmələ gələcəyindən və ya ağrılarının artacağından, ya da xəstəliyin uzanacağından qorxarsa, əzanı yumayıb əvəzində onu yaş əllə məsh etməlidir. Əgər məsh çəkməkdən də qorxarsa, onda yaranı və ya sınığı sarğı ilə bağladıqdan sonra onun hər tərəfinə bir dəfə məsh çəkməlidir. Belə olduğu halda sarğı yara və sınıq olan yerdən kənara çıxmamalıdır. Onu da qeyd etmək lazımdır ki, sarğını bağladıqda dəstəmazlı olmaq şərt deyil. Məsh etmək üçün müəyyən bir vaxt məhdudiyyəti də yoxdur. Əksinə, yara sağalanadək, qüsl və ya dəstəmaz əsnasında sarğı üzərinə məsh çəkmək olar.

**4. Məshi pozan amillər;** yaranın sağalması və yara sağaldıqdan sonra sarğının çıxarılması sarğı üzərinə məshin hökmünü ləğv edir.

## Su və torpaq tapmayan kəsin namazı

Su və ya torpaq tapmayan kəs *vaxtını keçirməyib* namazını olduğu halda qılmalı, *su və ya torpaq tapıldıqdan sonra* namazını təkrar qılmamalıdır. Muslimin "Səhih" əsərində rəvayət edilir ki, *bir dəfə* Aişə ﵂ *doğma bacısı* Əs-

madan burovuz[1] boyunbağı aldı. *Bir müddətdən* sonra o, boyunbağını itirdi. Buna görə də Peyğəmbər ﷺ səhabələrindən bir neçəsini göndərdi ki, onu axtarıb tapsınlar. Namaz vaxtı yetişdikdə onlar dəstəmazsız olduqları halda namaz qıldılar. Sonra Peyğəmbərin ﷺ yanına gəldikdə *su tapmadıqlarına görə* ona şikayət etdilər və *elə həmin vaxt* təyəmmüm ayəsi nazil oldu. Onda Useyd ibn Hudeyr *Aişəyə* dedi: "Allah səni xeyirlə mükafatlandırsın! Vallahi, indiyədək sənin başına elə bir iş gəlməmişdir ki, Allah bu işdə sənə bir yol göstərməsin və bu işi müsəlmanlar üçün bərəkətli etməsin". Bu səhabələr su tapmadıqlarına görə dəstəmazsız namaz qıldılar, sonra da bunu Peyğəmbərə ﷺ bildirdilər. Peyğəmbər ﷺ isə onlara nə bir etiraz etdi, nə də namazlarını təkrar qılmağı əmr etdi. Nəvəvi demişdir: "Bu hədis, dəlil olaraq ən tutarlı sözdür".

## Heyz

**1. Tərifi;** lüğəti mənada heyz: axmaq deməkdir. Bu fəsildə heyz deyildikdə isə, – doğuş və ya bakirəliyin itirilməsi kimi səbəblər istisna olmaqla, qadının sağlam halında *hər ay* uşaqlığından ifraz olan qan nəzərdə tutulur.

---

[1] Qaytarılmaq şərti ilə alınan; müvəqqəti istifadə üçün alınan.

**2. Vaxtı;** bir çox alimlərin fikrincə qız uşağı doqquz yaşından tez heyz ola bilməz. Əgər bu yaşa çatmazdan əvvəl qan görsə, bu, heyz qanı sayılmaz. Əksinə, bu, xəstəlik qanı hesab olunar. Heyz qanı ömrün sonunadək davam edə bilər. Heyz qanının müəyyən bir yaş dövründə kəsilməsinə dair heç bir dəlil varid olmamışdır. Deməli, yaşlı qadın belə nə zaman qan görərsə, onu heyz hesab etməlidir.

**3. Rəngi;** heyz qanının rəngi aşağıdakı rənglərdən birinə çalır:

a) Qara; Fatimə bint Əbu Hubeyş رضي الله عنها rəvayət edir ki, o, istihazə olurdu. Peyğəmbər ﷺ ona dedi: "Əgər axan qan qara rəngdədirsə, *bil ki,* bu, heyz qanıdır. Bu cür qan gəlsə namaz qılma. Yox əgər başqa rəng qan gələrsə, onda dəstəmaz al və namaz qıl. Bu, sadəcə damar qanıdır". Hədisi Əbu Davud, Nəsai, ibn Hibban, Daraqutni və Hakim rəvayət etmişdir. Daraqutni bu hədisin isnadında olan ravilərin hamısının etibarlı ravilər olduğunu demişdir. Hakim isə bu rəvayətin Muslimin şərtinə uyğun olduğunu söyləmişdir. [1]

b) Qırmızı; bu, qanın təbii rəngidir.

c) Sarı; bu, irinə bənzər, sarılığı daha çox olan bir mayedir.

---

[1] Hədis həsəndir. Səhih Əbu Davud, 263.

d) Bulanıq; bu, bulanıq suya bənzər qandır. Əlqəmə ibn Əbu Əlqəmə öz anasından – Aişənin kənizi Mərcanədən belə rəvayət etmişdir: “Qadınlar heyz qanını silmək üçün istifadə etdikləri, sarı rəngli maye hopmuş pambıq və ya bez parçanı qutuya qoyub *bunun hökmünü öyrənmək üçün* Aişəyə göndərərdilər. Aişə deyərdi: “Pambığın ağappaq çıxdığını görənədək gözləyin”. Hədisi Malik, Muhəmməd ibn Həsən, habelə Buxari “müəlləq” isnadla rəvayət etmişdir.[1] Bulanıq və sarı rəngli axan qan heyz günlərində axarsa, heyz qanından sayılar. Yox əgər digər günlərdə gəlsə, bu, heyz qanından sayılmaz. Ummu Ətiyyə رضي الله عنها belə rəvayət etmişdir: “Biz heyzdən sonra *gördüyümüz* sarı rəngli və ya bulanıq mayeni heyzdən hesab etməzdik”. Hədisi Əbu Davud və Buxari rəvayət etmişdir. Buxari "təmizləndikdən sonra" sözünü rəvayət etməmişdir.

**4. Müddəti;[2]** heyz qanının qısa və ya uzun müddət gəlməsinə dair heç bir dəlil varid olmamışdır. Əgər qadından mütəmadi olaraq *hər ay* eyni vaxtda qan gəlirsə,

---

[1] Hədis səhihdir. İrvaul Ğəlil, 1/218, 198-ci hədis.

[2] Alimlər heyzin müddətinə dair ixtilaf etmişlər: bəziləri onun ən qısa müddətinin həddi olmadığını söyləmiş, digəriləri ən qısa müddətinin bir gün bir gecə olduğunu söyləmiş, bəziləri də onun ən qısa müddətinin üç gün olduğunu demişlər. Heyz qanının ən uzun müddətinə gəldikdə isə onun on gün davam etdiyini demişlər. Bunun on beş gün davam etdiyini deyənlər də olmuşdur.

həmin günləri heyz müddəti hesab edə bilər. Ummu Sələmə ﷺ rəvayət edir ki, mən Peyğəmbərdən ﷺ *uşaqlığından* qan gələn qadın barəsində soruşdum. Peyğəmbər ﷺ buyurdu: "*Əvvəlki* aylarda nə qədər müddət heyz olmuşdursa həmin heyz olduğu günlərin sayı qədər gözləyib namazını tərk etsin. Sonra qüsl edib qanın qarşısını almaq üçün övrət yerini parça ilə örtsün, sonra da namazını qılsın". Hədisi Əhməd, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir.[1] Yox əgər qadından daim eyni vaxtda qan gəlmirsə, onda o, qanın rənginə baxaraq onun heyz qanı olub-olmadığını ayırd etməlidir. Fatimə bint Əbu Hubeyşin ﷺ hədisi də buna dəlalət edir. Bu hədisdə Peyğəmbər ﷺ belə demişdir: "Əgər axan qan qara rəngdədirsə, *bil ki,* bu, heyz qanıdır..." Hədisdən belə nəticə çıxır ki, heyz qanı digər qanlardan fərqlənir. Bunu isə qadınlar daha yaxşı bilir.

**5. İki heyz arasındakı təmizliyin müddəti;** alimlər ittifaq etmişlər ki, iki heyz arasında olan təmizlik müddətinin həddi müəyyən edilməmişdir. Bəziləri onun ən qısa müddətinin on beş gün olduğunu, digəriləri isə on üç gün olduğunu demişlər. Lakin həqiqət belədir ki, onun müddətinə dair heç bir dəlil varid olmamışdır.

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 244.

# Nifas

**1. Tərifi;** bu, uşaq doğduqdan sonra qadının uşaqlığından gələn qandır.

**2. Müddəti;** nifasın ən qısası üçün müddət yoxdur. Hətta bir anda belə kəsilə bilər. Əgər qadın uşağı doğan kimi qan kəsilsə, yaxud doğuş zamanı qan gəlməsə, nifasdan təmizlənmiş sayılır və təmiz qadınların yerinə yetirdiyi namaz, oruc və digər ibadətləri yerinə yetirmək ona da vacib olur. Nifasın ən uzun müddəti isə qırx gündür. Bunu Ummu Sələmənin رضي الله عنها rəvayət etdiyi hədislə əsaslandırmaq olar. O demişdir: "Peyğəmbərin zamanında nifas görən qadınlar qırx gün gözləyərdilər". Hədisi Əhməd, Əbu Davud, Tirmizi və ibn Macə rəvayət etmişdir.[1] Tirmizi bu hədisi rəvayət etdikdən sonra demişdir: "Peyğəmbərin ﷺ səhabələri, habelə tabiinlər və onların yolunu tutub gedən alimlər nifaslı qadının qırx gün müddətində namazı və orucu buraxması xüsusunda həmrəy olmuşlar." Qadının qırx gündən tez təmizlənməsi isə müstəsnadır. Belə olduğu təqdirdə qadın qüsl edib namaz qılmalıdır. Əgər qırx gündən sonra qan görərsə, əksər alimlərin dediyinə görə: "Qırx gündən sonra namazı buraxmamalıdır".

---

[1] Hədis həsəndir. İrvaul Ğəlil, 1/226; 211-ci hədis.

## Heyzli və ya nifaslı qadına haram olan əməllər

Cənabətli halda olan adama nələr qadağan olunursa, heyzli və nifaslı qadınlara da həmin əməllər qadağan olunur. Onların üçü də napak sayılır. Bu qadağan olunanlardan əlavə heyzli və nifaslı qadınlara aşağıdakılar da qadağandır:

**1. Oruc tutmaq;** heyz və nifas görmüş qadına oruc tutmaq haramdır. Qadın belə halda oruc tutsa, onun tutduğu oruc qəbul olmaz. Ramazan ayında heyz və nifas görmüş, (bu səbəbdən də orucunu və namazını buraxmış) qadın buraxdığı orucun qəzasını növbəti aylarda tutmalıdır. Namazlara gəlincə, əziyyət olmasın deyə onların qəzasını qılmaq vacib deyil. Belə ki, orucla müqayisədə namazlar çox təkrarlanır. Əbu Səid əl-Xudri ﵁ rəvayət edir ki, Peyğəmbər ﷺ qurban, yaxud fitrə bayramında namaz qılınan yerə getdi. Qadınların yanından keçdikdə (dayanıb) belə buyurdu: "Ey qadınlar! Sədəqə verin! Çünki mənə Cəhənnəm əhlinin əksəriyyətinin siz qadınlar olduğu göstərildi." Qadınlar: "Nəyə görə, ya Rəsulullah?"– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: "Çünki siz (insanları) tez-tez lənətləyir və ərlərinizə qarşı nankorluq edirsiniz. Mən ağıllı və ehtiyatlı bir adamın sizin qədər həm ağıl,

həm də din baxımından nöqsanlı olduğunu görmədim.” Qadınlar: “Dinimizdə və ağlımızda olan nöqsan nədir, ya Rəsulullah?”– deyə soruşdular. Peyğəmbər ﷺ buyurdu: “Məgər qadının şahidliyi kişinin şahidliyinin yarısına bərabər deyilmi?” Onlar: “Bəli!”– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: “Bu, qadının ağlının naqisliyidir. Məgər (qadın) heyz olduğu zaman namazını və orucunu tərk etmirmi?” Onlar: “Bəli!”– deyə cavab verdilər. Peyğəmbər ﷺ buyurdu: “Bu da, onun dininin naqisliyidir.” Hədisi Buxari və Muslim rəvayət etmişdir. Habelə rəvayət edilir ki, Muazə demişdir: “Mən Aişədən: “Nəyə görə heyzli qadın (heyz günlərində buraxdığı) orucun qəzasını tutur, amma namazın qəzasını qılmır?”– deyə soruşdum. (Aişə) dedi: “Sən hərurilərdənsən?!”[1] Mən: “(Yox,) həruri deyiləm, lakin soruşuram (ki, səbəbini öyrənim)”– deyə cavab verdim. (Aişə) dedi: “Biz Peyğəmbərin ﷺ dövründə heyz gördükdə bizə orucun qəzasını tutmaq əmr edilər, namazın qəzasını qılmaq isə əmr edilməzdi”. Hədisi Əhməd, Buxari, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir.

[1] Hərura – Kufə şəhərinin yaxınlığında yerləşən kənddir. Əli ibn Əbu Talibdən رضي الله عنه üz döndərib camaatdan ayrılmış on iki min xəvaric də məhz bu kənddə toplaşmış və camaata qarşı çıxmışlar. Onlar belə hesab edirdilər ki, heyzdən təmizlənmiş qadın heyz əsnasında buraxdığı namazlarını yenidən qılmalıdır.

**2. Yaxınlıq etmək;** Quran, Sünnə və alimlərin yekdil rəyinə əsasən bu haramdır. Odur ki, heyzli və nifaslı qadın təmizlənincəyə qədər onunla cinsi əlaqəyə girmək halal deyildir. Ənəs ﷺ demişdir: "Yəhudilər qadınları heyz olduqda onlarla (bir süfrədə) yemək yeməz və onlarla bir evdə qalmazdılar. Peyğəmbərin ﷺ səhabələri bunun haqqında ondan soruşdular və Uca Allah bu ayəni nazil etdi: **"Səndən heyz barəsində soruşurlar. De: "Bu, əziyyətverici bir haldır. Heyz vaxtı qadınlarla *yaxınlıq etməkdən* uzaq olun və pak olmayınca onlarla yaxınlıq etməyin. Onlar təmizləndikdən sonra isə Allahın sizə buyurduğu yerdən onlara yaxınlaşın". Şübhəsiz ki, Allah tövbə edənləri də sevir, pak olanları da".**[1] (Ayə nazil olduqdan) sonra Rəsulullah ﷺ buyurdu: "(O halda qadınlarınızla) cinsi əlaqədən başqa, istədiyinizi edə bilərsiniz!" Hədisi Əhməd, Muslim, Əbu Davud, Nəsai, Tirmizi və ibn Macə rəvayət etmişdir. Nəvəvi demişdir: "Bir müsəlman heyzli qadınla cinsi əlaqəyə girməyi halal hesab edərsə, kafir və mürtəd olar. Bunu halal saymayaraq unutqanlıqdan və ya onun hökmünü bilmədən, yaxud (qadının) heyzli olduğundan xəbərsiz ikən cinsi əlaqəyə girən kimsə isə günah qazanmır və buna görə kəffarə vermək də lazım gəlmir. Yox əgər qadının heyz olduğunu və bu əməlin haram sayıldığını bilə-bilə o bunu qəsdən edərsə, böyük bir günaha

[1] "əl-Bəqərə" surəsi, 222.

batmış olar. Bundan sonra o, buna görə tövbə etməlidir. Kəffarənin vacib olmasına gəldikdə isə buna dair iki rəy vardır. Bu rəylərdən ən doğrusu odur ki, bunu edən kimsəyə kəffarə vermək vacib deyil." Nəvəvi həmçinin demişdir: "İkinci növ: (alimlərin) yekdil fikrinə əsasən bədənin göbəkdən dizə qədər olan hissəsi istisna olmaqla (heyz vaxtı) qadının bədəninə toxunmaq caizdir. Üçüncü növ: cinsiyyət orqanı istisna olmaqla (heyz vaxtı) bədənin göbəkdən dizə qədər olan hissəsinə toxunmaqdır ki, bu da bir çox alimlərin fikrinə görə haramdır..." Daha sonra Nəvəvi bunun haram olmadığını, sadəcə məkruh olduğunu tərcih etmişdir. Çünki bu xüsusda varid olan hədislər daha mötəbərdir.

Nəvəvinin qəsd etdiyi dəlillər bunlardır: Peyğəmbərin ﷺ zövcələri belə rəvayət etmişlər: "Peyğəmbər ﷺ heyz görmüş zövcəsini əzizləmək istədikdə onun cinsiyyət üzvünün üstünə bir şey örtərdi." Hədisi Əbu Davud rəvayət etmişdir.[1] İbn Həcər bu hədisin isnadını tutarlı hesab etmişdir. Habelə rəvayət edilir ki, Məsruq ibn Əcdə demişdir: "Mən Aişədən soruşdum: "Kişinin zövcəsi heyzli ikən o, qadının harasına toxuna bilər?" Dedi: "Cinsi orqanından başqa hər yerinə (toxuna bilər)". Hədisi Buxari "Tarix" əsərində rəvayət etmişdir.

---

[1] Hədis səhihdir. Səhih Əbu Davud, 2/29; 263-cü hədis.

# İstihazə [1]

**1. Tərifi;** bu, heyz və nifas istisna olmaqla, bəlli olmayan vaxtlarda qadının uşaqlığından gələn qandır.

**2. İstihazənin halları;** istihazəli qadının üç halı ola bilər:

a) İstihazə olmamışdan əvvəl heyzin müddətinin bəlli olması. Belə olduğu halda bəlli olan müddət heyz müddəti, qalan müddət isə istihazə müddəti sayılır. Ummu Sələmə ﷺ rəvayət edir ki, mən Peyğəmbərdən ﷺ *uşaqlığından* qan gələn qadın barəsində soruşdum. Peyğəmbər ﷺ buyurdu: "*Əvvəlki* aylarda nə qədər müddət heyz olmuşdursa həmin heyz olduğu günlərin sayı qədər gözləyib namazını tərk etsin. Sonra qüsl edib qanın qarşısını almaq üçün övrət yerini parça ilə örtsün, sonra da namazını qılsın". Hədisi Malik, Şafii, Əhməd, Əbu Davud, Nəsai və ibn Macə rəvayət etmişdir. [2] Nəvəvi demişdir: "Bu hədisin isnadı Buxari və Muslimin şərtlərinə uyğundur." Xəttabi demişdir: "Bu, istihazə xəstəliyinə tutulmamışdan öncə, hələ sağlam ikən hər ayın bəlli bir günlərində heyz olan qadının hökmüdür. Sonradan həmin qadın istihazə halına düşüb davamlı qan axıdarsa, Peyğəmbər ﷺ ona, xəstəliyə

[1] Qadınların uşaqlıq yolundan patoloji hallarda axan qan.
[2] Hədis səhihdir. Səhih Əbu Davud, 244.

düşməmişdən öncəki aylarda heyz olduğu günlərin sayı qədər namazı tərk etməsini, həmin günlər başa çatdıqdan sonra isə bircə dəfə qüsl almasını əmr etmişdir. Artıq bu qadının hökmü pak qadınların hökmü kimi olur."

b) Heyz günlərinin müddəti bəlli olmayıb qanın davamlı axması halı. Ola bilsin ki qadın öz adətini unutsun, və yaxud istihazə halına məruz qalsın və beləliklə də ondan gələn qanın heyzdən, yoxsa, istihazədən olduğunu ayırd edə bilməsin. Belə olan halda əksər qadınlardakı adətə uyğun olaraq heyz günlərinin sayı altı və ya yeddi olaraq götürülür. Həmnə bint Cəhş رضي الله عنها rəvayət edir ki, məndən sox şiddətli qan gəlirdi. Odur ki, bunu Peyğəmbərə ﷺ deyib ondan fətva almaq üçün onun yanına gəldim və onu bacım Zeynəb bint Cəhşin رضي الله عنها evində tapdım. Mən, "Ya Rasulullah! Məndən çox şiddətli qan gəlir və bu da məni namazdan və orucdan məhrum edir. Bu barədə nə deyə bilərsən?" – deyə soruşdum. Peyğəmbər ﷺ dedi: "Pambıqdan istifadə etməyi tövsiyə edirəm, o qanın qarşısını alar." Qadın dedi: "*Pambıq kifayət etməz,* axı qan çox gəlir." Peyğəmbər ﷺ dedi: "İri bir parça ilə bərk bərk bağla." Qadın dedi: "*O da yetməz,* qan çox şiddətli gəlir." Peyğəmbər ﷺ dedi: "Onda sənə iki şeyi tövsiyə edirəm. Bunlardan hansı birini yerinə yetirsən digərini əvəz edər. Əgər hər

ikisinə gücün yetərsə onda ikisindən birinə seçim etmək sənin ixtiyarındadır. Bu davamlı qan gəlmək halı şeytanın zərbələrindən biridir. Allah daha yaxşı bilir, bu halda sən altı və ya yeddi gün heyzli kimi hərəkət et. Sonra tam təmizləndiyini yəqin edənədək yuyunub qüsl et və iyirmi dörd və ya iyirmi üç gün namaz qıl və oruc tut. Bu sənə kifayət edər. Bu minvalla sən hər ayda qadınların heyzli vaxtlarında və pak vaxtlarında etdikləri kimi et. *İkinci tövsiyəmə gəlincə;* əgər bacarsan belə edərsən: Zöhr namazını *əsrin vaxtına qədər* gecikdirib *vaxt girməmişdən öncə* qüsl al. Sonra zöhrü qıl və ardından da *vaxtı girmiş* əsr namazını qılıb bu iki namazı bu cür birləşdir. Məğrib namazını da *işanın vaxtına qədər* gecikdirib *vaxt girməmişdən öncə* qüsl al. Sonra məğribi qıl və ardından da *vaxtı girmiş* işa namazını qılıb bu iki namazı da belə birləşdir. Sübh namazı üçün isə ayrıca qüsl alıb qılarsan. Əgər bacararsansa namazlarını bu cür qıl və oruc tut. Bu iki tövsiyəmdən ən çox xoşuma gələni də elə budur." Hədisi Əhməd, Əbu Davud və Tirmizi rəvayət etmişdir.[1] Tirmizi demişdir: "Bu hədis həsən səhihdir. Buxaridən bu hədis barədə soruşdum, o da "həsəndir," dedi." Əhməd ibn Hənbəl də hədisin həsən səhih olduğunu demişdir. Xəttabi bu hədisin izahına bun-

[1] Hədis həsəndir. Səhih və Daif Sunən Əbu Davud, 287.

ları əlavə edib demişdir: “Hədisdə adı keçən Həmnə bint Cəhş ﵂ daha öncələr heyz görməyib, yeni heyz halı keçirən və heyz qanını digərlərindən ayırd edə bilməyən bir qadın idi. O, davamlı axan qan gördükdə, Peyğəmbər ﷺ, ona əksər qadınların adət halına uyğun hərəkət etməyi əmr etdi. Bu əmr əksər qadınların adətinə görə heyzin hər ayda bir dəfə olmasına dəlalət edir. Buna Peyğəmbərin ﷺ, “qadınların heyzli vaxtlarında və pak vaxtlarında etdikləri kimi et” sözü dəlalət edir. Heyz, hamiləlik, həddi büluğa çatma və qadınlarla əlaqəli buna bənzər digər əməllərdə, qadınları bir-birilərinə müqayisə edərək hökm verməyə bu hədis əsas dəlildir.

c) Qadının bəlli günlərinin olmaması, lakin heyz qanını digərindən ayırd edə bilməsi halı. Bu halda həmin qadın ayırd etdiyinə uyğun olaraq əməl edir. Fatimə bint Əbu Hubeyş ﵂ rəvayət edir ki, o, istihazə olurdu. Peyğəmbər ﷺ ona dedi: “Əgər axan qan qara rəngdədirsə, *bil ki,* bu, heyz qanıdır. Bu cür qan gəlsə namaz qılma. Yox əgər başqa rəng qan gələrsə, onda dəstəmaz al və namaz qıl. Bu, sadəcə damar qanıdır”. Hədis əvvəldə qeyd edilib.

3. **İstihazənin əhkamları;** İstihazə olan qadına aid bir neçə hökm vardır:

a) İstihazə olan qadın yalnız bircə dəfə, heyzdən qurtardıqdan sonra qüsl alır. Digər vaxtlarda isə hər hansı bir

namaz üçün qüsl almaq ona vacib deyildir. Keçmiş və indiki alimlərin əksəriyyəti bu fikirdədirlər.

b) Hər bir namaz üçün ayrıca dəstəmaz alması ona vacibdir. Buxarinin rəvayət etdiyi hədisdə Peyğəmbər ﷺ demişdir: "Sonra hər namaz üçün ayrıca dəstəmaz al." İmam Malikin rəyinə görə isə hər bir namaz üçün dəstəmaz alması müstəhəbdir. Yalnız dəstəmazı pozulduqda *yenidən dətəmaz almaq* vacib olur.

c) Dəstəmazdan öncə orqanını yuyur. Qanın qarşısını almaq və ya azaltmaq üçün isə oraya parça və ya pambıq qoyur. Əgər qan bununla kəsilməzsə, onda orqanını həmin parça ilə bərk-bərk örtür. Bu cür etmək ona vacib deyil, amma etsə daha yaxşı olar.

d) Alimlərin çoxunun rəyinə görə namazın vaxtı girməmişdən oncə dəstəmaz almamalıdır. Çünki həmin qadının təmizlənməsi zəruridir və ona görə də dəstəmazı ehtiyac vaxtından əvvələ çəkmək caiz deyildir.

h) Alimlərin çoxunun rəyinə görə istihazə qanı gəldiyi halda zövcəsinin onunla cinsi əlaqəyə girməsi caizdir. Çünki *bu halda* cinsi əlaqəyə girməyin haram olmasına dair heç bir dəlil yoxdur. İbn Abbas ؓ demişdir: "Namaz ən böyük əməl olduğu halda, istihazəli qadın əgər onu qılırsa, *onda* qadının zövcəsi onunla yaxınlıq da edə bilər." Bu

rəvayət Buxarinindir. Yəni, qan axsa belə qadına namaz qılmaq vacibdirsə – halbuki namaz üçün pak olmaq ən böyük şərtdir – zövcəsinin onunla cinsi əlaqəyə girməsi də caizdir. İkrimənin rəvayət etdiyi hədisdə deyilir ki, Həmnə ﵂ istihazə olduğu halda zövcəsi onunla cinsi əlaqəyə girirdi. Hədisi Əbu Davud və Beyhəqi rəvayət etmişdir. [1] Nəvavi; "Bu hədisin isnadı həsəndir."- demişdir.

e) Təmiz qadınlara aid olan hökmlər istihazəli qadınlara da şamil edilir. Belə ki, istihazəli qadın namaz qılır, oruc tutur, etikaf edir, Quran oxuyur, Quran kitabına toxuna bilir, onu əlinə ala bilir, *bir sözlə* bütün ibadətləri yerinə yetirə bilir. Bu barədə alimlər yekdil rəydədirlər.[2]

---

[1] Hədis həsəndir. Səhih Sunən Əbu Davud, 329.

[2] Heyz qanı murdar, istihazə qanı isə təbii qandır. Ona görə də birincisi ibadətləri qadağan edir, ikincisi isə yox.

# Mündəricat